*Mən Aşıq, özüm neylim,*
*Bu dərdə dözüm neylim?!*
*Ah çəksəm aləm yanar,*
*Çəkməsəm özüm neylim?!*

**Sarı Aşıq**



# Laçın yurdu

**№2(20)**
**2016**

**Bakı-2016**

# BU SAYIMIZDA

## HÖRMƏTLİ OXUCULAR!

Xatırladaq ki, "Laçın yurdu" jurnalını 2016-cı ildən ancaq abunə yolu ilə əldə etmək olar. Çünki jurnalın "Azərmətbuatyayımı"nın köşklərində satışını dayandırmışıq.

Jurnal hələlik rübdə bir dəfə (ildə 4 nömrə) çıxır. İllik abunə qiyməti **12 manat**dır.

# LAÇINLI TƏHSİL İŞÇİLƏRİNİN NÖVBƏTİ KONFRANSI KEÇİRİLİB

*Sentyabr ayının 7-də Laçın Rayon Təhsil işçilərinin növbəti konfransı keçirilib. Rayon Təhsil Şöbəsindən verilən məlumata görə, konfransdan əvvəl rayonun çoxsaylı təhsil işçiləri və ictimaiyyət nümayəndələri Taxtakörpü qəsəbəsində ulu öndər Heydər Əliyevin Rayon İcra Hakimiyyətinin inzibati binası qarşısında ucaldılmış büstünü ziyarət ediblər.*

Dövlət Himninin səsləndirilməsi ilə başlayan konfransda çıxış edən Rayon Təhsil Şöbəsinin müdiri Nicat Həsənov "2015-2016-cı dərs ilinin yekunları və qarşıda duran vəzifələr" mövzusunda məruzə ilə çıxış edib.




Ötən tədris ilində rayonun təhsil sahəsində əldə edilmiş uğurlar, həmçinin problemlər haqqında ətraflı məlumat verən N.Həsənov qeyd edib ki, bu il Laçın rayonunda fəaliyyət göstərən məktəblərdə təhsilini başa vuran 845 nəfər məzunun 633 nəfəri ali məktəblərə qəbul olunmaq üçün ərizə verib. Onlardan 325 nəfəri ali məktəblərə qəbul olunub (Qəbul imtahanlarında iştirak edən abituriyentlərin 51 %-i). Builki qəbul imtahanlarında rayon məzunlarının 57 nəfəri 500-dən, o cümlədən 15 nəfəri 600-dən yuxarı bal toplayıb.

Daha sonra Laçın Rayon İcra Hakimiyyətinin başçısı Aqil Nəzərli çıxış edərək ölkəmizdə prioritet məsələlərdən biri olan təhsil sahəsində görülən

işlərdən, ölkə başçısı cənab İlham Əliyevin təhsilə göstərdiyi hərtərəfli diqqət və qayğıdan danışaraq , ötən son 10 il ərzində də təhsilin inkişafı ilə bağlı mühüm sərəncamların imzalandığını qeyd edərək məktəblərin maddi-texniki bazasının möhkəmləndirilməsi istiqamətində xeyli işlərin görüldüyünü bildirib.

İcra başçısı vurğulayıb ki, təhsil müəssisələrinin fəaliyyəti daim Rayon İcra Hakimiyyətinin nəzarətində saxlanılır. Görülmüş işlərlə yanaşı rayon rəhbəri Rayon Təhsil Şöbəsinə və məktəb rəhbərlərinə qısa zamanda işlərində dönüş yaradılması, əmək intizamı, keyfiyyət göstəricilərinin yüksəldilməsi, vahid məktəbli formasına keçidin diqqətdə saxlanılması ilə bağlı konkret tapşırıqlarını verib.




Konfransda çıxış edən rayonun qabaqcıl və təcrübəli məktəb rəhbərləri, təhsil işçiləri, eyni zamanda ali məktəbə qəbul imtahanlarında rayon üzrə ən yüksək nəticə göstərmiş bir neçə şagird çıxış edərək, fikir və mülahizələrini bölüşüblər. Çıxış edənlər respublikamızda təhsilə göstərdikləri yüksək diqqət və qayğıya görə ölkə prezidenti cənab İlham Əliyevə və Heydər Əliyev Fondunun prezidenti Mehriban xanım Əliyevaya öz dərin minnətdarlıqlarını bildiriblər.

Tədbirdə ali məktəblərə qəbul imtahanında rayon üzrə ən yüksək nəticə göstərmiş abituriyentlərə Rayon Təhsil Şöbəsinin Fəxri fərmanı və pul mükafatı təqdim olunub.

***Konfransda ölkə prezidenti cənab İlham Əliyevə müraciət qəbul olunub.***

**MÜSAHİBƏ**

# YENİ DÖVRÜN TƏLƏBLƏRİNƏ UYĞUN OLARAQ KONSTİTUSİYADA MÜƏYYƏN ƏLAVƏ VƏ DƏYİŞİKLİKLƏRİN EDİLMƏSİ ZƏRURƏTİ YARANIB



**Mahir Abbaszadə:** Konstitusiyaya təklif olunan əlavə və dəyişikliklər dövlətimizin daha da güclənməsinə xidmət edəcək.

***Məlum olduğu kimi, sentyabrın 26-da Azərbaycan Respublikasının Konstitusiyasına əlavə və dəyişikliklər edilməsi ilə bağlı ümumxalq səsverməsi (referendum) keçiriləcək. Prezident İlham Əliyevin təşəbbüsü əsasında səsverməyə çıxarılan Referendum Aktına görə, Konstitusiyanın 23 maddəsinə (9, 24, 25, 29, 32, 36, 47, 49, 53, 56, 57, 58, 59, 60, 68, 71, 85, 89, 100, 101, 105, 121, 126) əlavə və dəyişikliklərin edilməsi, habelə yeni 6 maddənin (98, 103, 106, 108, 110, 146) əlavə edilməsi nəzərdə tutulub. Milli Məclisin deputatı Mahir Abbaszadə "Yeni Azərbaycan" qəzetinə verdiyi müsahibədə bu əlavə və dəyişikliklərin hansı sahələri əhatə etməsindən, həmçinin əhəmiyyətindən danışıb. Millət vəkili ilk olaraq bu əlavə və dəyişikliklərin hansı zərurətdən irəli gəldiyinə dair sualı cavablandırıb:***

– Öncə onu deyim ki, hazırda Azərbaycan çox ciddi hüquqi-siyasi hadisə ərəfəsindədir. Sentyabrın 26-da ölkəmizdə ümumxalq səsverməsi (referendum) keçiriləcək. Bəzən radikal düşərgə təmsilçiləri, yaxud hansısa “ekspertlər” bu dəyişikliklərin zəruri olmadığını iddia edir, özlərinin “haqlı” olduğunu sərgiləmək üçün müxtəlif əsassız açıqlamalarla gündəmi zəbt etməyə çalışırlar. Bu iddialara cavab olaraq bildirmək yerinə düşər ki, Konstitusiyaya təklif olunan əlavə və dəyişikliklər Azərbaycan Respublikasında gedən iqtisadi inkişafdan, ölkədə vətəndaşların hüquq və azadlıqlarının qorunması, dövlət strukturlarının təkmilləşdirilməsi, Silahlı Qüvvələrin gücləndirilməsi, respublikanın təhlükəsizlik sisteminin möhkəmləndirilməsi, vətəndaşların məhkəmələrə özlərinin hüquqlarının qorunması üçün müraciətlərinin tam şəkildə təmin edilməsi, o cümlədən seçkili orqanlarda iştirak və burada olan baryerlərin aradan qaldırılması zərurətindən, bilavasitə Azər-

baycanın qoşulduğu beynəlxalq konvensiyalardan, ölkəmizin beynəlxalq aləmdə nüfuzunun artmasından irəli gələn dəyişikliklərdir.

Məlum olduğu kimi, ulu öndər Heydər Əliyevin rəhbərliyi ilə hazırlanan və 1995-ci il noyabrın 12-də ümumxalq səsverməsi (referendum) yolu ilə qəbul edilən müstəqil Azərbaycanın ilk Konstitusiyası dünyanın ən mütərəqqi əsas qanunlarından sayılır. Lakin həyat yerində durmur. İnsanlar, cəmiyyət, dünya sürətlə dəyişir və inkişaf edir. Eyni zamanda, ötən hər gün meydana yeni tələblər, yeni meyarlar çıxarır. Təbii ki, yeni dövrün tələblərinə uyğun olaraq bir sıra qanunlarda, o cümlədən Əsas Qanunda müəyyən əlavə və dəyişikliklərin edilməsi zərurəti yaranır. Bir sözlə, gənc dövlət kimi Azərbaycanın fəaliyyəti, inkişafı, dünya dövlətləri arasında özünə layiqli yer tutması, beynəlxalq konvensiyalara qoşulması belə bir zərurət yaradıb ki, 2002-ci və 2009-cu illərdə olduğu kimi, bu dəfə də Konstitusiyada müəyyən əlavə və dəyişikliklər edilsin.

**– Dəyişikliklər əsasən insan hüquq və azadlıqlarının daha da genişləndirilməsini özündə ehtiva edir...**

– Ümumiyyətlə, bu dəfə təklif edilən əlavə və dəyişikliklərə blok şəklində baxsaq, görərik ki, onların bir hissəsi insan hüquq və azadlıqlarının müdafiəsinə həsr olunub. İnsan hüquqları ilə bağlı mövcud müddəalara bəzi vacib əlavə və dəyişikliklər təklif edilib. Məsələn, Konstitusiyanın 24-cü maddəsinə "İnsan ləyaqəti qorunur və ona hörmət edilir" ifadəsi əlavə olunması təklif edilib. Eyni zamanda, həmin maddəyə hüquqlardan sui-istifadəyə yol verilməməsi ilə bağlı vacib bir əlavə də edilib. İnsan hüquqlarının vacib elementi olan bərabərlik hüququ ilə bağlı Konstitusiyada təklif olunan yenilik isə əhalinin müxtəlif kateqoriyaları ilə bağlıdır. Məsələn, 25-ci maddəyə təklif edilib ki, birinci cümlədə "milliyyətindən" sözü "etnik mənsubiyyətindən" sözləri ilə, ikinci cümləsində "milli" sözü "etnik" sözü ilə əvəz edilsin. Bundan başqa, həmin maddəyə aşağıdakı məzmunda VI əlavə edilir: "Sağlamlıq imkanları məhdud olanlar, onların məhdud imkanlarına görə həyata keçirilməsi çətinləşən hüquq və vəzifələrdən başqa, bu Konstitusiyada təsbit olunmuş bütün hüquqlardan istifadə edir və vəzifələri daşıyırlar".

Referendum Aktı layihəsində yer alan vacib məsələlərdən biri də mülkiyyətlə bağlıdır. Məlumdur ki, bəzi hallarda mülkiyyət sahiblərinin davranışları və fəaliyyəti Azərbaycanın sosial dövlət fəlsəfəsinə uyğun gəlmir. Bir çox hallarda mülkiyyətçilər və ya sahibkarlar sahib olduqları mülkiyyətdən səmərəli istifadə olunmasında maraqlı olmur, ya da inhisarçı və istismarçı mövqedə dururlar. Bu isə Azərbaycanın ümumi iqtisadi maraqlarına cavab vermir. Belə olan halda, bu cür məsələlərin tənzimlənməsi zərurəti ortaya çıxır. Bununla yanaşı, sahibkarlıq subyektlərinin müxtəlif sosial layi-

hələrdə iştirak etməsi məsələsi də vacibdir. Yəni sahibkarlar, xüsusi mülkiyyətçilər öz sosial öhdəliklərini dərk etməlidirlər. Layihədə Konstitusiyanın 29-cu maddəsində V və VI hissələrə müvafiq olaraq "Xüsusi mülkiyyət sosial öhdəliklərə səbəb olur", "Sosial ədalət və torpaqlardan səmərəli istifadə məqsədi ilə torpaq üzərində mülkiyyət hüququ qanunla məhdudlaşdırıla bilər" məzmunlu cümlələrin əlavə edilməsi qeyd edilib. Bununla bağlı bildirmək yerinə düşər ki, ümummilli sərvət olan torpaqlardan səmərəli istifadə çox aktualdır. Hazırkı mərhələdə ölkəmizdə ərzaq təhlükəsizliyinin təmin olunmasına dair dövlət proqramları həyata keçirilir və bu sahədə təhlükəsizliyin təmin edilməsi üçün torpaq ehtiyatları əsas baza rolunu oynayır. Bu səbəbdən torpaqlardan səmərəli istifadə edilməsi məsələsi müstəsna əhəmiyyət kəsb edir. Elə sosial ədalət və torpaqlardan səmərəli istifadə məqsədi ilə torpaq üzərində mülkiyyət hüququnun qanunla məhdudlaşdırılması da məhz bu çağırışlardan irəli gəlir.

İnsan hüquqları ilə bağlı daha bir dəyişiklik şəxsi toxunulmazlıq hüququ ilə bağlıdır. Belə ki, təklif olunan dəyişikliklər şəxslərin toxunulmazlıq hüquqlarının daha da gücləndirilməsini nəzərdə tutub.

İnsan hüquqları blokuna dair sonuncu dəyişiklik təklifi isə 36-cı maddə ilə bağlıdır. Həmin dəyişiklik əmək hüququ əsasında işləyənlərin hüquqlarının müdafiəsini özündə ehtiva edir və elə bu səbəbdən də kifayət qədər böyük ictimai maraq doğurur. Bu məqsədlə müvafiq maddəyə edilən dəyişikliyə lokaut anlayışı əlavə edilib.

**– Məlumdur ki, təklif edilən dəyişikliklərdə ölkəmizin təhlükəsizliyi ilə bağlı mühüm müddəalar da öz əksini tapıb. Bununla bağlı fikirlərinizi bilmək maraqlı olardı...**

– Təbii ki, hər bir xalqın və dövlətin milli təhlükəsizliyi ən prioritet məsələdir. Bu mənada, təhlükəsizliyimizin konstitusion əsaslarının yaradılması üçün əsas qanuna ediləcək dəyişikliklər olduqca böyük əhəmiyyətə malikdir. Yəni bu gün dünyada cərəyan edən hadisələri, həmçinin bu hadisələr fonunda milli dövlətlərin mövcudluğuna ciddi təhdidlərin yaranmasını nəzərə alsaq, o zaman qeyd edə bilərik ki, Referendum Aktı layihəsində təhlükəsizlik məsələlərinin yer alması milli dövlətimizin təhlükəsizliyinin təmin olunması baxımından böyük əhəmiyyət daşıyır. Bu baxımdan təklif edilib ki, 58-ci maddənin IV hissəsinin birinci cümləsi aşağıdakı redaksiyada verilsin: "Azərbaycan Respublikasının bütün ərazisində və ya hər hansı hissəsində qanuni dövlət hakimiyyətini zorla devirmək məqsədi, cinayət hesab edilən digər məqsədlər güdən və ya cinayətkar üsullardan istifadə edən birliklər qadağandır".

Eyni zamanda, qüvvədə olan Konstitusiyanın 9-cu maddəsinin I hissəsində qeyd olunur ki, Azərbaycan Respublikası öz təhlükəsizliyini və müdafiəsini təmin etmək məqsədi ilə Silahlı Qüvvələr və başqa silahlı birləşmələr yaradır. Lakin bu maddədə Azərbaycan Ordusunun Silahlı Qüvvələrin bir hissəsi olduğu barədə əlavənin edilməsi bu maddənin tam mahiyyətini açmış olur və mövcud boşluğu aradan qaldırır. Belə ki, təklif olunan yeni redaksiyada 9-cu maddənin I hissəsində qeyd olunur ki: "Azərbaycan Respublikası öz təhlükəsizliyini və müdafiəsini təmin etmək məqsədi ilə Silahlı Qüvvələr yaradır. Silahlı Qüvvələr Azərbaycan Ordusundan və başqa silahlı birləşmələrdən ibarətdir".

Heç şübhəsiz, bu dəyişikliyin konstitusion norma səviyyəsinə qaldırılması qeyri-qanuni hərbi birləşmələrin yaradılmasının qarşısını almaq üçün vacib hüquqi bazanı formalaşdırmış olur. Silahlı birləşmələr dedikdə onun tərkibində çoxsaylı qoşun növlərinin olmasından söhbət gedir. Bu dəyişikliklər qeyri-qanuni silahlı birləşmələrin yaradılmasının qarşısının alınması məsələsini gündəmə gətirir. Bu, dünyada son zamanlar yaşanan hadisələrlə bağlıdır. Yəni təhlükəsizlik məsələlərindən doğan zərurətdir. Bu baxımdan konstitusion norma ilə özünün təsdiqini tapması vacibdir.

**– Bundan başqa, dövlət idarəçiliyinin təkmilləşdirilməsi ilə bağlı bir sıra mühüm dəyişikliklər də nəzərdə tutulur. Bu dəyişikliklərin mahiyyətini necə izah edərdiniz?**

– Birmənalı olaraq qeyd etmək yerinə düşər ki, Referendum Aktında idarəetmə institutlarında yeni keyfiyyət dəyişikliklərinin yaradılması da nəzərdə tutulub. Yəni Konstitusiya Aktı layihəsinə əlavə edilmiş 4 yeni maddə (103, 106,108 və 110-cu maddələr) ilk növbədə dövlət strukturlarının optimal təkmilləşdirilməsi, onların səlahiyyətlərinin dəqiqləşdirilməsi və son nəticədə yaxşı idarəetmə mexanizmlərinin tələblərinə cavab verməsi mahiyyəti kəsb edir. Həmin dəyişikliklərə əsasən, ölkəmizin siyasi idarəçilik sistemində ilk dəfə olaraq Azərbaycan Respublikasının birinci vitse-prezidenti və vitse-prezidentləri vəzifələrinin təsis edilməsi nəzərdə tutulub. Bu isə heç də təsadüfi deyil. O mənada ki, Azərbaycan prezidentli respublikadır, bəzi hallarda bir-birini təkrar edən müəyyən idarəetmə strukturları var. Prezident üsul-idarə sisteminin mövcud olduğu bir sıra ölkələrdə ölkə prezidenti 7 il müddətinə seçilir və ali icraedici hakimiyyətin başçısı kimi özünə birinci vitse-prezident və vitse-prezidentlər təyin etmək hüququ var. Bu sistem idarəetmədə yeni keyfiyyət yaradır. Ona görə də vitse-prezidentlik institutunun yaradılması Azərbaycanda idarəetmə sahəsində yeni və olduqca vacib hadisədir. Layihədə əks olunmuş təklifə əsasən, Azərbaycan Respublikasının birinci vitse-prezidenti və vitse-prezidentləri Azərbaycan

Respublikasının Prezidenti tərəfindən vəzifəyə təyin və vəzifədən azad edilirlər. Eyni zamanda, layihədə Konstitusiyaya "Azərbaycan Respublikasının vitse-prezidenti vəzifəsinə seçkilərdə iştirak etmək hüququna malik olan, ali təhsilli, başqa dövlətlər qarşısında öhdəliyi olmayan Azərbaycan Respublikasının vətəndaşı təyin edilir" məzmunlu cümlənin əlavə edilməsi də qeyd edilib. Beləliklə, Azərbaycanda yeni effektiv, optimal idarəetmə institutu yaradılacaq. Prezidentlik institutu daha da güclənəcək və idarəetmədə yeni operativ və effektiv mərhələ başlayacaq.

**– Bəs bir millət vəkili kimi, dəyişikliklər paketində parlamentin səlahiyyətləri ilə bağlı öz əksini tapan müddəalarla bağlı nələri vurğulamaq istərdiniz?**

– Referendum Aktı layihəsində əksini tapan məsələlərdən biri də Azərbaycan Respublikasının Milli Məclisi ilə bağlıdır. Layihədə qeyd edilib ki, "Azərbaycan Respublikası Milli Məclisinin eyni çağırışı bir il ərzində iki dəfə Azərbaycan Respublikasının Nazirlər Kabinetinə etimadsızlıq göstərdikdə və ya Azərbaycan Respublikası Prezidentinin təqdimatına əsasən Azərbaycan Respublikasının Konstitusiya Məhkəməsinin, Azərbaycan Respublikası Ali Məhkəməsinin və Azərbaycan Respublikası Mərkəzi Bankı İdarə Heyətinin kollegial fəaliyyəti üçün zəruri olan sayda onlara üzvlüyə namizədləri iki dəfə təqdim edildikdən sonra, qanunla müəyyən edilmiş müddətdə təyin etmədikdə, habelə bu Konstitusiyanın 94-cü və 95-ci maddələrində, 96-cı maddəsinin II, III, IV və V hissələrində, 97-ci maddəsində göstərilən vəzifələrini aradan qaldırıla bilməyən səbəblər üzündən icra etmədikdə Azərbaycan Respublikasının Prezidenti Azərbaycan Respublikasının Milli Məclisini buraxır". Müharibə şəraitində olan, ərazisinin 20 faizinin işğal altında olduğu bir ölkə üçün hakimiyyətin vahid bir mərkəzdə formalaşması olduqca vacib məsələlərdən biridir. Prezidentə bu səlahiyyətin verilməsi prezidentlik institutunu daha da möhkəmləndirməklə ölkənin təhlükəsizliyinin təmin olunmasına xidmət edəcək.

Bir sözlə, Konstitusiyaya əlavə və dəyişikliklərlə bağlı Referendum Aktı günün tələbidir və əminəm ki, xalqımız bu islahatlara səs verəcək.

**ARAŞDIRMA**

## DAĞLARIN SULTANI

Azərbaycan yenidən öz müstəqilliyinə qovuşduqdan sonra, vaxtilə sovet rejimi tərəfindən adları yasaqlanmış bir çox məşhur həmyerlimizin həyatına işıq düşür ki, onların Vətən və millət qarşısındakı xidmətləri araşdırılır. Belələrindən 20-ci əsrin əvvəllərində erməni daşnak quldur dəstələrinə qarşı

amansız mübarizə aparmış Sultan bəy və Xosrov bəy Sultanov qardaşlarını qeyd etmək olar.

İstər mətbuat səhifələrində, istər sosial şəbəkələrdə, istərsə də elm adamları tərəfindən qardaşların həyatı və fəaliyyətləri haqqında çox maraqlı araşdırmalar aparılır ki, bu da təqdirəlayiq bir haldır. Belə işlərə görə bir laçınlı olaraq, əməyi keçən hər kəsə təşəkkür edirəm. Ancaq bütün bunlarla bərabər, təəssüf ki, Sultanov qardaşlarının həyatı haqqında yazılar yazılarkən bəzi yanlışlıqlara yol verilir. Məni bu yazını yazmağa vadar edən də məhz həmin məqamlar oldu və qarşıma məqsəd qoydum ki, həmin yanlışlıqlara aydınlıq gətirəm. Çünki, hərb tariximizin görkəmli araşdırmaçılarından olan Şəmistan Nəzirli demişkən: "Tarix də riyaziyyat kimi dəqiq olmalıdır".



Paşa bəy kimdir? Bu haqda indiyə qədər çox yazılıb. Elə ən çox səhvlərə yol verilən məqamlar da, Paşa bəyin kimliyi barədədir. Paşa bəy o zamanlar Qarabağın Dağlıq hissəsində tanınan, əslən Laçın rayonunun Yuxarı Çorman kəndindən olan məşhur çarvadar (qatırçı) Muradın (əsl adı Xanmuraddır) oğludur. Xanmurad həddindən artıq qoçaq adam olub. Təsadüfi deyildir ki, həmin vaxtlar el arasında Molla Pənah Vaqiflə bağlı zərbi-məsələ əlavə edərək belə deyiblər: "Hər oxuyan Molla Pənah, hər qatırçı Murad olmaz". Xanmurad əvvəlcə Laçın rayonunun Hətəmlər kəndindən, Əhməd oğlu Şahverdinin bacısı Ağapərini qaçırdaraq onunla ailə qurur və bu izdivacdan oğlu Paşa (Əlipaşa bəy) dünyaya gəlir. Sonradan bir az da şöhrətpərəst olan Xanmurad o vaxtlar əsilzadə bəylərdən olan Əsəd Sultanlarla qohum olmaq qərarına gəlir və ikinci arvad olaraq onlardan bir qızla evlənir. Həmin xanımdan isə Xanmuradın daha bir oğlu, Əmir bəy dünyaya gəlir. Bir müddət keçdikdən sonra uşaqlar böyüyür və Xanmurad da əsilzadə bəylərlə olan qohumluğundan istifadə edərək, "bəylik komissiyası"na müraciət edir ki, ona "bəylik" versinlər. Lakin "bəylik komissiyası" onun nəslində bəy olmadığını əsas gətirərək ona bəylik rütbəsi verməkdən imtina edir. Əvəzində isə ona təklif olunur ki, sənin əsilzadə bəy qızından olan oğlun Əmirə bəylik verək. Xanmurad isə çox tədbirli adam olduğundan komissiyaya bildirir ki, onda gərək digər oğlum Paşaya da bəylik verəsiniz. Yenə də komissiya üzvləri onunla razılaşmır ki, bu oğlunun bəylərlə qohumluq əlaqəsi yoxdur. Ancaq Xanmurad bəylik komissiyasının üzvlərini inandırır ki, guya Paşanı Əsəd Sultanlardan olan "dul" anası yanın-

da gətirib. Beləcə o, əsilzadə bəylərlə qohumluq əlaqəsi olan oğlu Əmirə və bəylərlə heç bir qohumluq əlaqəsi olmayan digər oğlu Paşaya da "bəylik" rütbəsi alır...

Məlumdur ki, Paşa bəy Qurdhacı kəndində məskən salır və onun İsgəndər, Sultan və Xosrov adlı oğulları olur. Sultan bəylə Xosrov bəyin qəhrəmanlıqlarından kifayət qədər yazıldığı üçün təkrara yol vermək istəmirəm. Bəzi müəlliflər qeyd edirlər ki, guya Sultan bəyin adı ana babasına hörmət əlaməti olaraq atası tərəfindən qoyulub. Guya onun adı əvvəllər Əsəd Sultan olub, sonradan isə Əsəd adı unudulub, yalnız adın Sultan hissəsi qalıb. Tamamilə yanlış, həqiqətlə heç bir əlaqəsi olmayan bir fikirdir. Yuxarıda Paşa bəyin kimliyindən bəhs etdiyim üçün, bir daha həmin fikirlərin üzərinə qayıtmaq istəmirəm. Ancaq bir neçə məqamı diqqətinizə çatdırmaq istərdim. Hamıya məlumdur ki, Paşa bəy dövrünün ən müdrik, ən ağıllı adamlarından biri olub. İstər bizim Azərbaycan türkləri, istərsə də Osmanlı türkləri, adətən öz övladlarına atalarının adlarını qoyardılar, qayınatalarının adlarını yox. O da ola, Paşa bəy kimi bir kişi bunu etməzdi. Soruşa bilərlər ki, bəs Sultan adı haradan gəlmişdir. İndi gəlin Paşa bəyin övladlarının adlarına baxaq: Bir oğluna dünya fatehi Makedoniyalı İsgəndərin şərəfinə İsgəndər, o biri oğluna məşhur İran şahı Xosrov Pərvizin şərəfinə Xosrov, digərinə isə Fatih Sultan Məhmədin şərəfinə Sultan adını qoymuşdur. Artıq burada başqa-başqa fərziyyələr üzərində düşünmək, baş sındırmaq tamamilə yersiz və mənasızdır. Yeri gəlmişkən, onu da əlavə edim ki, Xanmuradın adını Əmir bəy öz oğluna vermişdir. Hal-hazırda Əmir bəyin oğlu Murad bəyin oğlanlarından yalnız Mütalib bəy, eləcə də nəvələrinin bir çoxu Bərdə rayonunda yaşayırlar. Murad bəyin digər oğlanları, Xosrov bəy, Zülü bəy və Əmir bəy dünyalarını dəyişiblər...

Digər bir məsələyə də diqqət yetirək. Bəziləri yazırlar ki, Andranikin qulağını Sultan bəy kəsib. Bu da tamamilə bir uydurmadır. Onun qulağını türk ordusunda xidmət edərkən, onlara xəyanət etdiyi üçün türklər kəsiblər. Özü də tam yox, yalnız bir hissəsini kəsiblər ki, "qulağında qalsın, ağasına xəyanət edənin sonu belə olur". Sultan bəy isə Qarabağda türklərin qanını tökməyə can atan, onu pulla ələ almağa çalışan Andranikin qoşunlarını Zabux kəndi ərazisində darmadağın etdi, özünü isə ayaqları arasından keçirərək onun nə qədər alçaq olduğunu sübut etdi və canını bağışladı. Ümumiyyətlə, artıq məğlub olmuş insanlara işgəncə vermək, fiziki xəsarət yetirmək halları türklərə xas olan əlamət deyildir. Təbii ki, düşmənə qarşı amansız olmaq, ona zərbə vurmaq, döyüş zamanı düşməni məhv etmək müharibənin qızıl qaydalarıdır. Amma məğlub insanlara işgəncə vermək, hətta meyitlərin

üzərində alçaldıcı hərəkətlərə yol verməк, dünyada ermənilərə və erməni-xislətli məxluqlara xas olan əlamətlərdir...

Bəzən də Sultanov qardaşlarının fəaliyyətlərinə bir az da qısqanclıqla yanaşılır. Məlumdur ki, ADR hökuməti formalaşanda, ilk hərbi nazir Xosrov bəy Sultanov olmuşdur. Sonradan isə peşəkar hərbçi olduğu üçün onu Səməd bəy Mehmandarov əvəzləmişdir. Amma nədənsə çox vaxt ilk hərbi nazir kimi Səməd bəy Mehmandarovun adı çəkilir. Sözsüz ki, Səməd bəy Mehmandarovun Azərbaycanın hərb tarixində müstəsna xidmətləri olmuşdur. Ancaq Xosrov bəy Sultanovun az bir müddətə də olsa, bu sahəyə rəhbərlik etməsi, onun müstəqil Azərbaycan Respublikası üçün nə qədər əhəmiyyətli bir şəxsiyyət olduğuna dəlalət edir... Bəzən də Sultan bəyin kürd olması barədə yersiz fərziyyələr irəli sürülür. Mən bu haqda, hələ 1991-ci ildə Əhməd Elbrusun təsisçisi və baş redaktorluğu altında çap edilən "Dədəm Qorqud" qəzetində bir yazı yazmışdım. Həmin yazıda bir daha Sultan bəyin kimliyinə aydınlıq gətirmişdim.

Qeyd etmək istərdim ki, həmin vaxtlar Paşa bəy və onun oğlanları haqqında yazı yazanlar demək olar ki, yox dərəcəsində idi. Yazanlar isə onları "burjua tör-töküntüləri" kimi, hətta "xalq düşməni" kimi qələmə verirdilər. Maraqlı burasıdır ki, bir çox hallarda bəylərin ünvanına tənqidi çıxışlar edib mənsəb sahibi olanlar, indi onlara sahib çıxmağa çalışırlar. Nə deyək, Allah yardımçıları olsun...

O ki, qaldı Sultan bəyin milli mənsubluğuna, o, Laçın rayonunda böyük tayfalardan olan türk soylu Qasımuşağı nəslinin nümayəndəsidir. Bu haqda tarixi mənbələrdə də kifayət qədər məlumatlar vardır. Nədənsə Azərbaycan xalqı qarşısında misilsiz xidmətləri olmuş Sultan və Xosrov bəy qardaşlarının talelərinə nəzər saldıqda adamı qərib bir kədər və üzüntü ağuşuna alıb aparır. Milli məfkurəni, milli ruhu, milli düşüncəni məhv etməyə çalışan, onu əlimizdən alan canavar xislətli qırmızı imperiya bu qardaşların öz yurdlarında yaşayıb, öz yurdlarında haqqın dərgahına qovuşmalarını da onlara çox gördü. Bu azmış kimi öz müstəqilliyimizə yenicə qovuşduğumuz bir zamanda, imperiyanın sadiq köpəkləri tərəfindən bəylərin ruhu dolaşan torpaqlarımız işğal olundu.



Bütün bunlara rəğmən təsəlliverici haldır ki, Sultanov qardaşlarının mühacir həyatı doğma Türkiyədə keçib və elə doğma yurd olaraq haqqın dərgahına da orada qovuşublar. Digər tərəfdən bizdə böyük bir inam var ki, tezliklə torpaqlarımızı imperiya köpəklərindən azad edəcəyik. O günlərə lap az qalıb.

**Ələddin ƏHMƏDOV**

**POEZİYA**



**Yadigar HƏŞİMOV**

## YENƏ

Kaş çin ola arzularım,
Mişni, səni görəm yenə.
Yamacında şehli-şehli,
Çiçəyini üzəm yenə.

Göz yollarda, qulaq səsdə,
Həsrətindən düşdüm xəstə.
Meşələrdə bulaq üstə,
Açıb süfrə sərəm yenə.

Göy çəməndə yatam qalam,
Xoş ətrindən bihuş olam.
Təbiətdən ilham alam,
Sözlə dola sinəm yenə.

Təzə qarda çıxam ova,
Əllərimi ova-ova.
Kəklikləri qova-qova,
Atıb yerə sərəm yenə.

Bulaqları bir-bir gəzəm,
Cığırlarda otu əzəm.
Bənövşəni şehli üzəm,
Bahar ola çiləm yenə.

Düşəm çöldə gur yağışa,
Qaçam girəm bir koğuşa.
Axşam düşə, şər qovuşa,
Kəndə gecə gələm yenə.

Gəlib çata vüsal dəmi,
Çıxa üzə batan gəmi.
Ürəyimdən dərdi, qəmi,
Birdəfəlik siləm yenə.

## YURD HƏSRƏTİ

Neçə ildir həsrət dolu gözlərim,
Doğma yurdun sorağında qalıbdır.
Nə müddətdir dəyməsə də ayağım,
Könlüm ilhamını ordan alıbdır.

Həsrət qaldım bulaqların gözünə,
Qaragölə, Qaraçılar düzünə.
Baxan yoxdur qaçqınların üzünə,
Qardaş, bizi yaman ilan çalıbdır.

Cilligölə xoş düşəydi güzarım,
Qalmaz idi zərrə dərdim, azarım.
O torpaqda qazıla kaş məzarım,
Fələk bizi yaman dərdə salıbdır.

Hanı bulaqların o bal şirəsi,
Cilligölün qantəpəri, zirəsi.
Gizitkanla, xırmanotu kətəsi,
Dadı hələ damağımda qalıbdır.

Düşə yolum bir də Qarıqışlağa,
Gəzəm çəmənliyi, çıxam daşlığa.
Bu sinəmdə yer qalmayıb boşluğa,
Qəm-qüssə qəlbimdə sıralanıbdır.

Kürdivanla, Qarakötük dərəsi,
Oxunmamış bir tarixdir hərəsi.
Qantəpəri, kəklikotusu, zirəsi,
O qaniçən yağılara qalıbdır.

Yolunu gözləyir Sona bulağı,
Hər tərəfi yemlik quzuqulağı.
Bir köç eylə yüklə atı, ulağı,
Gül çöhrələr intizardan solubdur.

Kamal, bir də düşə yolun dağlara,
Qayıdasan o əvvəlki çağlara.
Baş çəkəsən çayqırağı bağlara,
Orda neçə ocaq yerin qalıbdır.

Çıxmaz yaddan Ulukörpün, Göydüzün,
Göy çəmənin, tər bənövşən, nərgizin.
Zülmət gecələrə dönüb gündüzün,
Həsrətdən ürəyim paralanıbdır.

Girov qalıb Novlubulaq, Qaragöl,
Gül-çiçəkli yal-yamacın, çəmən, çöl.
Yenə köç eyləyə dağa oba, el,
Dindirmə ürəyim yaman dolubdur.

Sağalmaz bu Yadigarın yarası,
Orda qalıb ürəyimin parası.
O dağlardı ancaq onun çarası,
Gör nə vaxtdan intizarda qalıbdır.

**BU GECƏ**

Yuxuda getmişdim kəndə bu gecə,
Sındırıb sal buzu saf su içirdim.
Bilmirəm olmuşdu axı bu necə?
Keçilməz yolları rahat keçirdim.

Yuxuda getmişdim kəndə bu gecə,
Getmişdim yüz ilin həsrətlisitək.
Bağrıma basmışdım sərt qayaları,
Ən əziz, mehriban istəklilərtək.

Yuxuda getmişdim kəndə bu gecə,
Çayın qırağında gəzirdim yenə.
Bir daşın üstündə qızıl balığı
Oturub çubuğa düzürdüm yenə.

Yuxuda getmişdim kəndə bu gecə
Həsrəti bir anlıq unutmaq üçün.
Doğma vətənimə, yurda qovuşub
Gözümün yaşını qurutmaq üçün.

**AXTAR BABALARI**

## QƏLBLƏRDƏ YAŞAYAN ƏVƏZLİ XATİRƏLƏR...

Əvəz Verdiyev Böyük Vətən müharibəsində Laçın rayonundan Sovet İttifaqı Qəhrəmanı adı almış yeganə şəxsdir. Onun igidliyi, qəhrəmanlığı, təvazökarlığı, yüksək vətənpərvərliyi barədə çox danışılıb, elin-obanın söhbət mənbəyi olub. Sağlığında "Qızıl Ulduz"la Vətənə dönüb, kəndlərin, Laçın şəhərinin qonağı olub, gənclərə müharibənin acı həqiqətlərini söyləyib. Uşaqlıq və gəncliyinin ən yaxşı illərini yaşadığı Maxsutlu kəndində ata əvəzi Bəşir kişinin, anası Qəndabın, bacı-qardaşlarının, qohumlarının, elinin sevinci olub. Təvazökar söhbətləri ilə hamını valeh edib. Mən xeyli müddət

qəhrəman Əvəz haqqında eldə dolaşan xatirələri olduğu kimi toplayıb "Laçın yurdu"nun oxucularına təqdim etmək fikrində olmuşam.



O dövrün yaşlı insanları söyləyirdilər ki, Əvəz Verdiyev Laçın rayonunun Quşçular kəndində anadan olub. Atası Həşim kişi ailəsi ilə birlikdə Bakının Bülbülə kəndinə köçür və orada işləyir. Lakin Həşim kişi tezliklə dünyasını dəyişdiyindən, Qəndab kiçik Əvəzi də götürüb yenidən Quşçulara qayıdır. Amma bəzi mətbuatda onun Bakıda doğulması göstərilir. Sonralar Qəndab xanım Maxsutlu kəndinin sayılıb-seçilən kişilərindən olan Bəşir bəylə ailə qurur. O, Əvəzi böyük oğlu kimi sevir, tərbiyəsi ilə ciddi məşğul olur. Elə Əvəz də ona oğul məhəbbəti bəsləyir, atasızlıq hiss etmir. Əvəzin uşaqlıq və ilk gənclik illəri Maxsutluda keçir. İlk təhsilini alır, fermada yazı işləri görür, hesablayıcı olur, kolxozun başqa çətin işlərini yerinə yetirir, hamının dərin hörmətini qazanır.

Əvəz Verdiyev 20 yaşında Bakıya gələrək, ata qohumlarının köməyi ilə Bülbülə kəndində zavodda işlə təmin olunur. Burada da istehsalatın sirlərinə yiyələnir, yüksək əmək vərdişləri qazanır. Vaxtaşırı kəndə – ailəsinin görüşünə gəlirmiş.

1939-cu ildə hərbi xidmətə çağırılır. Sovet–Fin müharibəsində iştirak edir. Yüksək döyüş bacarığı qazanır. Ordudan tərxis olunduqdan sonra Vətənə qayıdaraq əmək fəaliyyətinə başlayır. Bu dinc həyat uzun sürmür. 1941-ci ilin iyununda Böyük Vətən müharibəsi başlayır. Əvəz könüllü olaraq birincilər sırasında müharibəyə gedir. Düşmənə sonsuz nifrət hissi ilə Rostov şəhərində döyüşlərə atılır. Fin müharibəsindəki təcrübədən yararlanır, mahir kəşfiyyatçı kimi döyüş tapşırıqlarını yerinə yetirir. Döyüşlərin birində ağır yaralanan Əvəz hospitalda müalicə olunur, yenidən döyüş dostlarının yanına qayıdır. 1942–1943-cü illərdə Ə.Verdiyev Xarkov, Orlov, Lvov vilayətlərinin alman faşistlərindən təmizlənməsində xüsusi şücaət və igidliklər göstərmiş, döyüş orden və medalları ilə, təşəkkürlərlə mükafatlandırılmışdı. Artıq sovet–alman cəbhəsində üstünlük qoşunlarımıza keçmişdi. 1944-cü ildə starşina Əvəz Verdiyevin dəstəsi Visla çayı sahillərində əməliyyatlar aparırdı. O, Sitaşa şəhərinin alınmasında böyük qəhrəmanlıqlar göstərir. Bu döyüşdə düşmənin 13 əsgər və zabitini əsir götürür. Bir əməliyyatda isə çayı üzərək o biri sahildə kəşfiyyat aparır və yenidən hissəyə qayıdır. Bu əməliyyatlarda ona Sovet İttifaqı Qəhrəmanı adı verilir. Radioda

Yuri Levitanın oxuduğu fərman bütün Azərbaycan üçün sevinc xəbəri idi. Yaşlı nəsil o xəbərin indi də yaddaşlarda qaldığını söyləyirlər.

Əvəz Verdiyev Qəhrəman adı aldıqdan sonra ona Azərbaycana gəlməsi üçün məzuniyyət verilir. 1944-cü ilin payızında Laçına gələn qəhrəman həd-siz sevinclə, mehribanlıqla qarşılanır. Doğmalarının, kəndinin, elin, obanın – bütün rayonun əziz qonağı olur. Ətraf kəndlərin camaatı, Laçın şəhərinin əhalisi onu gül-çiçəklə qarşılayıb fəxri adını təbrik edirlər. O, məktəblərin qonağı olub, gənclərə hərbin yollarından, müharibədəki uğurlarımızdan danışır.

Vaxt tamam olanda yenidən döyüşən orduya qayıdır. Artıq 1945-ci ilin uğurlu tarixi hadisələri baş verirdi. Sovet Ordusu müharibənin taleyini həll etmək üzrə idi. Əvəz Verdiyev Polşa torpaqlarının düşməndən azad edilmə-sində iştirak edir, xüsusən Sitaşa şəhərində böyük qəhrəmanlıqlar göstərir. 1945-ci ilin bir mayında böyük qələbəyə 6 gün qalmış Polşada qəhrəman-casına həlak olmuş, orada qardaşlıq məzarında dəfn olunmuşdur. Onun qısa, lakin mənalı ömür yolu belə tamamlanır. Amma Əvəz Verdiyevi sevənlər onu qəlblərində yaşadır, qəhrəmanlıqlarını dastana döndərərək dildən-dilə, nəsildən-nəsilə ötürürlər. Beləcə eldə, obada xoş xatirələr dolaşır. Onlardan bir neçəsini sizlərə təqdim edirik.

**Rəhmətlik atam Əliqulu müəllim deyirdi ki,** Əvəzin ilk gəncliyi Maxsutluda keçmişdir. O yaşca bizdən böyük idi. Odur ki, onun gözəl məsləhətlərinə, ağıllı tədbirlərinə həmişə ehtiyacımız olurdu. Dayım Bəşir bəy Qəndab xanımla ailə qurduqdan sonra Əvəzə əsl atalıq göstərmişdi. Ona düzgün tərbiyə verməklə, əməksevər gənc kimi böyütdü. Yadımdadır ki, Əvəz həm fermada işləyir, həm də evlərinin böyük təsərrüfatının idarə olun-masında ailəyə köməklik göstərirdi. Bəşir dayımın Durna, Nabat, Nəriman, Sultan adlı övladları Əvəzi böyük qardaş kimi sonsuz məhəbbətlə sevirdilər. Onun Qəhrəman kimi Maxsutluya gəlişini indi də xatırlayıram. Gecə yarıya kimi söhbət edər, həräni maraqlandıran sualları aydınlaşdırardı. Onun yeni-dən müharibəyə qayıtması və ölüm xəbəri hamını sarsıtdı.

**Əvəz Verdiyevin böyük bacısı Durna xanımın qızı Xədicə dayısı haqda kədərlə danışdı:** Mən həyatda anam Durna qədər qardaşını sevən qadın tanımıram. Ağlım kəsəndən anamın Əvəz dayım barədə xatirələrini eşitmişəm, göz yaşlarını görmüşəm. O yas məclislərində ürəkdağlayan ağı-larla: “Qəriblikdə qalan qardaşım”, – deyə ağlayırdı. Anam Sovet İttifaqı Qəhrəmanının “Qızıl Ulduz”larını, SSRİ Ali Soveti Rəyasət Heyətinin Fər-manını, digər orden və medalları xüsusi mücrüdə saxlayır, hər gün oxşa-yaraq sanki təsəlli tapırdı. Anam keçən il dünyasını dəyişib. O son nəfəsində dayımın şəklini sinəsinə sıxaraq “Əvəz” deyib gözlərini əbədi yumdu.

Əvəz Verdiyevin kiçik bacısı Nabat xala da qardaşını dünyalar qədər istəyirdi. Hazırda ömrünün ixtiyar çağını yaşayan Nabatın övladları Suğra, Afiq, Rafiq, Gözəl, Qətibə, Qəşəng dayılarının igidliyi ilə qürur duyurlar. Əvəzin qardaşı Nəriman el-obanın sevilən oğullarından olub. Vaxtsız dünyasını dəyişib. Sonagül, Mehri adlı iki qızı yadigar qalıb. Əvəz Verdiyevin kiçik qardaşı Sultan da qardaşı ilə fəxr edib, onun adına hörmətlə yanaşıb. Sultanın gəncliyi Maxsutluda keçsə də, sonralar Bakıda yaşayıb. Onun övladları İpək, Yaqub, Vaqif, Ofeliya, Nurəngiz əmiləri ilə haqlı olaraq öyünürlər.

**Laçın rayonunun o vaxtki Rəfi kəndində yaşayan Yusif Səlim oğlu Həsənov danışırdı:** Biz gənclər həmişə Ağzıbir gölündə çimmək yarışları keçirirdik. Həkəri çayının bu hissəsi burulğanlı olduğundan çox adam o biri sahilə üzə bilmirdi. Maxsutludan hər gün bura gələn Əvəz bu işi bacarıqla edirdi. O, yaraşıqlı, hündürboy, cəsarətli bir gənc idi. Cavanlarla mehriban söhbətlər edirdi. Həkəri çayını balıq kimi üzürdü. Onun bu bacarığı müharibədə köməyinə gəlmişdi. Visla çayını üzərək o biri sahilə keçib kəşfiyyat aparmışdı. Əvəz Qəhrəman kimi Maxsutluya qayıdanda mən də ora gedib ailəsini təbrik etdim. Biz onunla fəxr edirdik!

**Əmim Abbasov Məmmədqulu danışırdı ki,** deyilənə görə Əvəz əsgərliyə gedəndə bir qızı sevirmiş. Amma onun adını heç kimə deməyib, bir qız bilirmiş, bir də özü. Qıza söz verib ki, məni gözlə müharibə qurtaran kimi toy edərik. Əvəz ailəsinə məktubda yazarmış ki, o tərəflərdə vəziyyət necədi? Məndən salam deyərsiniz! Evdə oxunan məktubun məzmunu o saat yayılarmış. Çoxları bir şey anlamasa da ismarıc yiyəsinə çatarmış və bu həmişə təkrarlanarmış...

**Maxsutlu kəndinin sakini Əliş Ədiloğlu sağlığında danışardı:** Əvəzin kəndə gəlişi əmim Bəşirin evinə toy-bayram gətirmişdi. Hər gün qonaqlar gəlirdi. Mən Əvəzdən əl çəkmirdim. Boş vaxt olan kimi kəndin məşhur yerlərini – Yaxşının Qəbrini, Marışın bulağını, Qaratikan düzünü, Arpa yerini, Atlarsürüşəni, Nənə kahasını, Zur dərəni, Məşədi Kərbəlayi Abbasın yurdunu, Rusdaşbasdıranı və s. gəzib dolanardıq. O, uşaqlıq və gəncliyinin keçdiyi bu yerlərə necə həssas yanaşırdı. O, əsl vətənpərvər oğul idi.

Əvəz yenidən cəbhəyə yollananda əmim yaman kövrəlmişdi. Əvəz də bunu hiss etmişdi. Onlar qucaqlaşdılar. Əvəz: Narahat olmayın, tezliklə qayıdıb sizin üçün toy çaldıracağam! – dedi. Onun dalınca su atdılar. Heç kim bilmirdi ki, bu son görüşdür.

**1975-ci ildə Qələbənin 30-cu ildönümünə hazırlıq gedirdi.** Jurnalist Fəridə Babayeva "Sovet İttifaqı Qəhrəmanı Əvəz Verdiyev" adlı kitabça nəşr etdirmişdi. Orada jurnalist Əvəzi daha çox Bülbülə sakini kimi təqdim

edirdi. Onun Laçın həyatından qısa danışılmışdı. Bu birtərəflilik Əvəzin qohumlarını narahat etmişdi. Mən o dövrdə Bülbülədə məktəb direktoru işləyən, Əvəzin əmisi qızı Dünya xanımla söhbətləşmək üçün həmin məktəbə getmişdim. O, məni səmimi qarşıladı. Mən kitabdakı bəzi faktların dəqiq şərhini verdim, ağsaqqalların narazılığını söylədim. O, mənimlə razılaşdı və zarafatla dedi ki, – Ay oğul niyə narahat olursunuz? Əvəz həm sizindir, həm də bizim. O, bütün Azərbaycanın, Laçının qəhrəmanıdır. Onunla fəxr edirik!..

**Maxsutlu kəndinin sakini Abbasov Əli Əliş oğlu deyir:** – Ailəmizdə, kəndimizdə Əvəz haqqında çox danışılıb. Uşaqlıqdan onun şəxsiyyətinin vurğunu olmuşam. Tələbə olarkən Bakıda Əvəzin qardaşı Sultan, bacısı Durnagilə tez-tez gedirdim. Onlar atamın əmisi uşaqları idi. Həmişə söhbətlər Əvəzlə yekunlaşırdı. Sonralar mən Laçın şəhərində yaşayırdım. Hər gün işə gedəndə və işdən qayıdanda internat məktəbinin həyətindəki əzəmətli heykəlini görürdüm və sonsuz qürur duyurdum. Anam Zabuta mənə dedi ki, məni Əvəzin heykəlinə apar. O, Durna kimi ağı deyərək ağladı, sonra qəhrəmanın Maxsutluya qayıdışından maraqlı detallar danışdı.

**1985-ci ildə faşizm üzərində Qələbənin 40-cı illiyinə həsr olunmuş tədbirlər keçirilirdi.** Səfiyan kəndində idarə binasının həyətində Əvəz Verdiyevin büstü qoyulmuşdu. O məşhur tədbirin iştirakçısı olmuş, sonralar Qarabağ müharibəsinin veteranı, hazırda Sumqayıt şəhər 38 saylı orta məktəbin müəllimi Şahin Qəhrəmanov deyir: – Əvəz Verdiyev mənim üçün həyat idealı olub. Mənim bibim Suqra Əvəzin qardaşı Nərimanın həyat yoldaşı olub. Onun qızları ilə həmişə əmiləri barədə söhbətlərimiz olub. Deyirlər ki, o məzuniyyətə gələrkən keçmiş dostlarına müharibədən maraqlı səhnələr danışarmış. Səfiyan kəndinin ağsaqqalı Həsən əmiyə "Qızıl Ulduz"u necə qazanmağını söhbət edib. Həsən əmi ilə qəhrəmanın bu tarixi söhbəti neçə illərdir eldə danışılır. Mən də "Abidə önündə düşüncələr" poemamda həmin dialoqu qələmə almışam və ilk dəfə həmin tədbirdə oxumuşam: Oradan bəzi şeirləri təqdim edirəm.

Cəbhədən gələndə məzuniyyətə,
Ulduzlar yoluna endi Əvəzin.
Yamaclar al geydi, dağlar ucaldı,
Bulaqlar önündə dindi Əvəzin.

Hamı yallı getdi tutub qol-qola,
Çoxları ağladı eyləmədi tab.
Üz qoyub oğlunun gəldiyi yola,
Yüz yol qurban oldu anası Qəndab.

Yanaqlar islandı sevinc yaşıyla,
Otaqlar neçə yol boşaldı-doldu.
Qəhrəman Əvəzin gəlişi ilə,
Maxsutlu kəndi də çilçıraq oldu.

Bir aylıq gəlmişdi o, kəndimizə,
Cəbhədən çox şeylər danışdı bizə.
Söylədi: dərələr, dağlar aşmışıq
Neçə yol ölümlə qarşılaşmışıq.

Cəbhəyə qayıtdı o igid yenə,
Dönmədi bir daha doğma kəndinə.
Qələbə günündən beşcə gün əvvəl
Düşmən gülləsinə tuş etdi əcəl.

Sanmayın yazdığım bir əfsanədir
Qəhrəman Əvəzin mərdlik səsidir.

Bu gün də o səsi eşidirik biz,
Arzusu sonsuzdur, istəyi təmiz.

O səs qoşulubdur əbədiyyətə,
Yenə qəhrəmanlıq öyrədir bizə.
O səslə bağlıyıq şeirə, sənətə,
O səs bələdçidir qələbəmizə!

**Xatirələr çoxdur...** Sonda onu demək istəyirəm ki, Əvəz Verdiyevin qəhrəmanlığı unudulmur. Xalq onu Laçının ilk Sovet İttifaqı Qəhrəmanı kimi yaşadır. İşğaldan öncə Laçın şəhərində onun adına küçə olub, şəhərdəki orta internat məktəbi onun adını daşıyıb. Məktəbin həyətində əzəmətli heykəli ucaldılmışdı. Bakının Bülbülə kəndində vaxtilə işlədiyi zavodun həyətində büstü qoyulmuşdur. Qəsəbədə onun adına küçə verilmişdir.

Maxsutlu kəndinin stansiya adlanan yerində uzun müddət fəaliyyət göstərən həftə bazarı onun adını daşımışdır. Səfiyan kəndinin mərkəzində büstü ucaldılmışdır. Ətraf kəndləri birləşdirən kolxoz sonralar isə sovxoz Əvəz Verdiyevin adını şərəflə daşımışdır.

Sonralar Əvəzin doğma torpaqları ermənilər tərəfindən işğal olundu. Xalq öz torpaqlarını müdafiəyə qalxdı. Ər oğullar düz on beş ay erməni quldurlarına qarşı mərdliklə döyüşdülər. Vaxtilə özlərinə ideal qəhrəman saydıqları Əvəz Verdiyevin igidliklərini təkrarladılar, yeri gələndə şəhidlik zirvəsinə yüksəldilər. Beləcə beş laçınlı Azərbaycanın Milli Qəhrəmanı adına layiq görüldü. Onlar da bu gün hər bir laçınlı üçün qürur mənbəyidir, səcdəgahların zirvəsidir. Onlar həmişə belə xatırlanacaqlar, yaşayacaqlar.

Xalq şairi Səməd Vurğunun dediyi kimi:

Ölüm sevinməsin qoy, ömrünü vermir bada
El qədrini canından daha əziz bilənlər.
Şirin bir xatirətək qalacaqdır dünyada
Sevərək yaşayanlar, sevilərək ölənlər.

Əslində qəhrəmanlar ölmürlər. Onlar əbədiyyət üfüqlərində doğan eşq günəşidir. Xatirələr isə tarixlər boyu yaşayaraq nəsillərə ötürüləcək.



**Yaqub ABBASOV,**
***R.Hümbətov adına Güləbird kənd***
***tam orta məktəbinin riyaziyyat müəllimi,***
***Qarabağ müharibəsi veteranı.***

**POEZİYA**



**Məhəmməd HƏSƏNQULİYEV**
***Laçın rayonunun Qarakeçdi kəndi,***
***Əməkdar müəllim***

## DƏYƏR

***"Azərbaycan" jurnalının sentyabr 2015-ci il tarixli 9-cu sayında həmyerlim Daşdılı Bənövşənin nəşr olunmuş şeirlərindən təsirlənib yazdım.***

Daşdılı Bənövşə, şairə qızım
İzin ver, şeirinə bənzətmə yazım.
Demə: – başqa izə düşmək nə lazım?
Mən də Laçınımı sevmirəm məgər?
Əşarına cavab yazmağa dəyər.

Sən ki Bənövşəni dağa qul sandın,
Vətən dağı üçün alışıb-yandın.
Şeirində həsrətlə Laçını andın,
Təqdir et şairi – ürəyim deyər,
Bax onda qaydanı pozmağa dəyər.

Sənin "Bənövşəni", "Dağlar" şeirini,
Qələmə aldığın öz "Dəyər"ini.
Oxudum, əxz etdim qəm-kədərini,
Həsrətdən qürbətdə bişərsə ciyər,
Əlacın min yerə yozmağa dəyər.

Qardaş-qardaş deyib çox aldanmışıq,
Nankor qonşulara mehr salmışıq.
Sonda tapdağında əsir qalmışıq,
Qadir Allah nicat verərsə əgər,
Ermənini kökün qazmağa dəyər.

Məhəmmədəm, oda qalandı kəndim,
Mən də qürbətlərdə bitdim, tükəndim.
İllər boyu bəxtə, Rəbbə güvəndim,
Nalələrim təsirsiz qalsa əgər,
Qan yaş olub gözdən sızmağa dəyər.

## ÖZÜ SÜRÜB DÖVRANINI

Aşiqə laqeyd baxma,
Yox eyləmə imanını.
İncidib get-gələ salma,
Doğru söylə ünvanını.

Bənövşədi, güldü üzün,
Canlar alır ala gözün,
Dərmandı bir "hə" sözün,
Əsirgəmə dərmanını.

Kəkilin sünbül səməni,
Heyran eyləyir aləmi.
İntizar qoyma sevəni,
Gecikdirmə fərmanını.

Baba oxşar nəvəsini,
Duyar isti nəfəsini.
İstər gəlin görsün səni,
Heç eyləmə gümanını.

Demə, gülməlidi bu hal,
Nəyimə baxır saqqalı çal.
Qəlbi deyir qayınata ol,
Özü sürüb dövranını.

**O KƏND BİZİM KƏNDİMİZDİ**

## BOZDAĞAN KƏNDİ

Günlər, aylar, illər bir-birini yola salır, yaz keçir, yay ötür, payız yetişir, bir də başını qaldırıb görürsən ki, qarlı qış qapının astanasındadır. Bax beləcə ömür karvanı aram-aram, bizim hiss etmədiyimiz dərəcədə ötüb keçir. Mən arxaya yox, yalnız irəli baxmağı xoşlayıram. Amma geriyə – keçmişə baxmadan gələcəyi qurmaq mümkün olmadığından hərdən dönüb geriyə baxıram.

Qasımuşağı obası özünün dağ vüqarlı, uzun ömürlü, möhtəşəm gövdəli, kökləri ana torpağın dərin qatlarına işləyən, əzəmətli “Qızıl palıd”ı ilə məşhurdur. Əsrlər boyu obamızın keşməkeşli tarixinə lal şahid olmuş, dünyanın ən yaşlı ağacları olan bu “Qızıl palıd”ların dibindən çıxan, suyu dupduru və saf bulaqların yayda buz kimi soyuq, qışda ılıq suyunu, saf, yüngül, təmiz havasını udan hər kəs bu yerləri çətin ki, unuda bilər. Elə bu səbəbdən də rəngarəng daşlarında, sərt qayasında, yaşıl don geyinmiş yal-yamacında gəncliyimin ilkin çağlarının ən yadda qalan ılıq və kövrək xatirəsinin izlərini saxlayan, cənnətmisal Kürdhacı kəndinin Qarapalçıq adlanan zirvəsinin cənub yamaclarından dayanıb Qasımuşağı obasının ərazisini seyr etdiyim günlər gözlərim önündə canlandı. Buradan Dəlidağ nə qədər uzaqda görünsə də Qırxqız bir o qədər yaxında idi. Qırxqızın ətəyində Çilgəz çayın yatağında Ələkçi, Nağdalı, Şamkənd və Çorman kəndlərini aydın görmək mümkün idi. Bu kəndlərdən fərqli, Qırxqızın yuxarı ətəklərinə sığınmış, Çilgəz çayın yatağından xeyli hündürdə qərar tutan bir yaşayış məntəqəsi özünəməxsus görkəmi ilə seçilirdi.

Nəhəng dünyanın kiçicik, çox kiçicik bir parçası olan Qasımuşağı kimi gözəl bir obasının ərazisində, təbiətinin qeyri-adi gözəlliyi ilə insanları valeh edən kəndlərindən birinin, Şamkənd kəndinin inzibati ərazi vahidində yerləşən Bozdağan kəndinin tarixi keçmişindən, dünənki vəziyyətindən, bugünkü durumundan sizlər üçün kifayət qədər maraqlı olacaq məlumatlar toplamağa çalışmışam.

**Kəndin tarixi durumu:** İlk öncə Bozdağan toponiminin etimologiyasına daha anlaşıqlı tərzdə aydınlıq gətirmək lazımdır. Bu səbəbdən də toponimin mənşəyi, yaranma tarixi, mənası ilə bağlı bəzi fikirlər haqqında araşdırmalar aparıb elmi əsası olanları önə çəkmək daha düzgün olardı.

Azərbaycan dili oğuz dil qrupuna daxil olan türk dillərinin bir qolu olduğu üçün onun qrammatik quruluşu və əsas lüğət fondu digər türk sistemli dillər ilə ümumilik təşkil edir. Tarixə nəzər salsaq görərik ki, Azərbaycan

xalqının da daxil olduğu oğuz qəbilə ittifaqları uzun müddət bir sıra digər türk tayfaları, xüsusilə qazax, qaraqalpaq, qırğız, altay, noqay, Krım tatarları kimi qıpçaq tayfaları ilə ictimai-siyasi əlaqədə olmuşdur. Ona görə də müasir Azərbaycan ədəbi dilində bu qrup dillərin leksik xüsusiyyətlərini daşıyan bir sıra sözlərə təsadüf edilir. Belə sözlər arasında mövcud olan totemlərin içərisində müqəddəs quşlar xüsusi əhəmiyyət kəsb edir. Totem (mif) quşlardan qartal, laçın, şahin, toğan, sunqur, göyərçin və digərlərini göstərmək olar. Bu növ zoomorfik totemlərlə əlaqədar antropotoponimlərin etimologiyasını araşdırdıqca məlum olur ki, qədim türklərin müqəddəs hesab etdikləri heyvaların adı bir sistem şəklində yer-yurd adlarında mühafizə olunmuşdur. Eyni zamanda həmin mifoloji toponimlərin işlənmə arealı kifayət qədər genişdir. Bozdağan toponimi də bu növ sözlərə aiddir.

Bu oykonim oğuzların qayı, bayat, al-karavlı, qaravul boylarının onqonu sayılan və müqəddəs hesab edilən toğan quşu ilə əlaqədardır. Şahinin bir növü olan Boz toğan KDQ-də də toğan quşu kimi xatırlanır. T(d)oğan sözü bəzi türk dillərində “qırğı”, “şonqar”, “çalağan”, “ağ quş” mənalarında işlənən şahin sözü ilə bağlıdır. Mənbələrə əsasən demək olar ki, “toğan” bütövlükdə ov quşlarına verilmiş ümumi addır. Tanınmış dilçi-alim, filologiya elmləri doktoru, professor Qara Məşədiyev öz tədqiqatında bozdoğanları yürüklərin boylarından biri olduğunu qeyd edir və həmin boyun bozdoğan adında izinin qaldığını göstərir. Filologiya üzrə fəlsəfə doktoru Elşad Şərəfxan oğlu Abışov da Qara müəllimin bu fikrinə şərik çıxır. Həmin toponimin Bozdağan adlanması isə Azərbaycan dilində o//a səs keçidi nəticəsində baş vermişdir.

Yazılı mənbələrdə Bozdağan//Bozdoğan//Boztoğan adlı oba, oymaq və məzrələrin olması haqqında məlumatlar heç də az deyil. Bozdağan sözü mürəkkəb söz olmaqla iki sözdən – boz və dağan//toğan sözlərindən ibarət olan mürəkkəb etnotoponimdir. Etnotoponim oğuzların qədim tayfalarından biri olan Bozdoğan tayfasının adından formalaşdığı ehtimal olunur. Bozdağan sözü təkcə toponimlərdə deyil, tarixi şəxsiyyətlərin ad və soyadlarında da (Boz Toğan oğlu Ziyaülmülk) özünü qoruyub saxlamış və bu gün də istifadə edilir. Hətta düşməni yaralamaq və qalxanı (zirehi) sındırmaq (dağıtmaq) üçün yaxın məsafədən istifadə edilən hərbi silah olan əmud (toppuz, şeşpər) türk dilində bozdoğan adlandırılır.

Göygöl rayonu ərazisində Toğana (Toğanalı) kəndi və eyni adlı hidronim də qədim türklərin onqon (totemi) quşu Bozdoğanla bağlıdır. Həmin onqon quşun adı şəxs adına, oradan da etnonimə və nəhayət toponimə keçmişdir.

Bozdoğan tayfalarının köçəri həyat tərzi sürdüklərini nəzərə alsaq, ehtimal ki, tarixin hansısa dönəmində həmin tayfaya mənsub insanlar Laçın

rayonunun Bozdağan kəndində və yaxud ona yaxın bir ərazidə məskunlaşdıqlarını söyləməyə əsas verir. Belə ki, 1593-cü ildə Osmanlı dövləti Məğavuz nahiyəsinin oba, кənd, qışlaq və məzrələrini siyahıya aldığı zaman siyahıda bu ərazidə iki Bozdağan adlı kənd qeydə alınmışdır. Lakin bundan fərqli olaraq 1727-ci ildə bu ərazilərin Xaçın məlikliyinin tərкibində yerləşdiyi dövrdə Osmanlı dövlətinin yenidən apardığı siyahıyaalma zamanı isə bu kəndlərdən hər ikisi qeydə alınmamışdır.

Bozdoğan adlı bir neçə kənd, eləcə də qəsəbə və şəhər indi də Türkiyə ərazisində mövcuddur. Bu toponimlərə Türkiyənin Trabzon, Aydın, Çorum, Mersin, Adıyaman, Adana şəhərlərinin yaxınlığında rast gəlmək mümkündür. Həmin yaşayış məskənlərində Bozdoğan tayfasının müxtəlif qollarına mənsub olan əhali yaşayır. Burada yaşayan Bozdoğanlar Türkmanlardır. Onlar bu gün də Çukurova bölgəsində yaşayırlar.

İndiki Ermənistan Respublikasının Ani rayonunun ərazisində, azərbaycanlılar yaşamış Bozdoğan (Boz Toğan) adlı yaşayış məntəqəsi mövcud olmuşdur. Bu fakt "İrəvan əyalətinin icmal dəftəri"ndə İrəvan yaxınlığında Arpaçaydan 8 verst aralıda Bozdoğan adlı kəndin olduğu qeyd olunub. Ermənilər 3 yanvar 1953-cü ildən kəndin adını dəyişdirib Sarakap (Dağətəyi kənd) etmişlər. 1853-1856 illərdə, rus-türk müharibələrinin meydanı olan bu ərazidən rusların təsiri ilə yerli əhali Arpaçayı adlayaraq Türkiyəyə getmişlər.

Kənd sakinləri arasında Bozdağan kəndinin adı haqqında müxtəlif maraqlı məlumatlar söylənilir. Söylənilənlərdən ən çox dəyərli olanı isə bu toponimin "Bozdağ" mənasında işlənməsidir. Səbəb kimi kəndin uca dağların, sıldırım boz qayaların qoynunda yerləşməsi göstərilir. Həmin boz rəngli qayalar metamorfiq dağ suxuru sayılan mərmər tərkiblidir. 1990-cı ildə kəndin Qazı yeri adlanan ərazidə mərmər emalatxanası açıldı. Ancaq bu iş erməni quldurlarının işğalı nəticəsində başa çatdırılmadı.

**Kəndin mədəniyyəti:** Bozdağan kənd mədəniyyəti Qasımuşağı obası mədəniyyətinin tərkib hissəsinin bir parçasıdır. Burada müxtəlif vaxtlarda sənətkarlıq və tətbiqi sənət xüsusi diqqət tələb etmişdir. Belə ki, XVIII yüzilliyin ortalarında Qasımuşağı obasının ərazisində yüksək keyfiyyətli tikmə, xalça və xalça məmulatlarının hazırlanması nəticəsində burada toxuculuğun sürətli inkişafı ilə nəticələndi. Bu baxımdan Bozdağanda da toxuculuqla yanaşı dülgərlik, dəmirçilik, bənnalıq, heyvandarlıq, əkinçilik və digər peşələrin mənimsənilməsi ətraf kəndlərlə həmahəng inkişaf edirdi. Kənd qadınları əsasən kustar üsulla ip əyrilməsi, xalça məmulatları və xalça toxunması ilə məşğul olurdu. Bacarıqlı qadınlar payız və qış aylarında xalça, palaz, gəbə, kilim, xurcun, çuval, keçə (qəlib), şəddə, yun corab, nəmənd, fərməş, heybə, örkən, şötrük, sicim, çatı, gözək, əlcək toxumaq və müxtəlif tik-

mələr tikməklə məşğul olardılar. Buna görə də kənddə ailələrin bir çoxunda toxucu dəzgah (hana və yer hanası) var idi. XX əsrin əvvəllərində kənd sakini Bayramova Şamama Mahmud qızının (1880-1996), Məmmədova Səkinə Əli qızının, Mikayılova Əziz Məmmədrza qızının toxuduğu xalça və xalça məmulatları xüsusi ilə fərqlənirdi. Həmin xalça məmulatlarından nümunələr bu gün də kənd sakinlərinin şəxsi kolleksiyalarında saxlanılmaqdadır. Görünüşü ilə hər kəsə gəl-gəl deyən bu xalça və fərşlər (iri gəbələr) daha dəyərli və maraqlı olurdu.

Bozdağan da daxil olmaqla ətraf kəndlərin sakinlərinin bir-birinə yaxın qohumluq əlaqələrinin olması səbəbindən kənddə olan xeyir və şər mərasimlərini hamı toplaşıb birlikdə yola verərdi. Məclis sahibinin bu işlərdən heç bir çətinliyi olmazdı. Təkcə bu sahədə deyil, digər bütün ağır işləri yola vermək üçün ən gözəl adətlərdən biri, həmrəylik nümunəsi – “hov” (“hav”, “iməcilik”) edilər, yaranmış çətinlik birlikdə aradan qaldırılardı.

Keçən əsrin ortalarına qədər əhali dən üyütmək üçün yaxınlıqda yerləşən Səmədin dəyirmanından istifadə edərdi. Ərazi meşə örtüyü olan sahədə qərar tutduğundan evlərin dam örtüyü qırmızı palıddan hazırlanmış taxta kirəmitlə örtülərdi. Nağdalı və Hacısamlı kəndlərində Taxta zavodunun fəaliyyətə başlamasından sonra bu cür damı olan evlərin sayı daha da çoxaldı. Ermənistan Silahlı Qüvvələrinin bu əraziləri işğal etdiyi vaxta qədər damı taxta kirəmitlə örtülü evlərin bir neçəsi hələ də qalmaqda idi. Kəndin bəzi ərazilərində alban qəbiristanlıqları olmasına baxmayaraq, araşdırılmamış halda qaldı.

Ta qədimdən son dövrlərə qədər kənd ərazisində olan bağ və bostanlar mənbəyini çaydan götürən su arxları ilə suvarılırdı. Kəndin yerləşdiyi ərazidə hər məhəllədə təbii bulaqların çoxluğu səbəbindən kəndə boru vasitəsi ilə su çəkilməsinə ehtiyac olmamışdır. Kənd əhalisi içməli su təminatını məhz bu məhəllələrdə olan bulaqlar vasitəsi ilə ödəyirdi.

1992-ci il 18 may tarixində Ermənistan Respublikası Silahlı Qüvvələri tərəfindən işğal edilənə qədər Bozdağan kəndində 51 ev, əhaliyə məxsus 42 tövlə, Kirov adına sovxoza məxsus mal-qara üçün 2 böyük tövlə, 1 mağaza olub. Bu ucqar dağ kəndində məktəb olmayıb. Kiçik və böyük yaşlı məktəblilər Nağdalı, Şamkənd və Kürdhacı kəndlərində olan məktəblərdə tam orta təhsil alıblar.

**Kəndin təbiəti:** Dərin dərələri, dağ çayları, bulaqları, qalın meşələri, yaşıl çəmənləri, gözəl çeşmələri, müalicəvi bitkiləri, uca zirvələri və sərt qayalıqları olan gözəl təbiətə malik ucqar dağ kəndlərindən olan Bozdağanın göz oxşayan mənzərələri insanı valeh edir. Kənd respublikanın paytaxtı Bakı şəhərindən şose yolla 514 km qərbdə, rayon mərkəzindən şose yolla 64

km şimal-qərbdə, Kiçik Qafqaz sıra dağlarında, Qarabağ silsiləsinin cənub-qərb yamacında, civə ehtiyatı ilə zəngin Çilgəzçayın sahilindən 2 km hündür bir ərazidə yerləşir. Xankəndi dəmir yolu stansiyası ilə şose yolla ara məsafəsi 124 km-dir. Dəniz səviyyəsindən 1785 metr yüksəklikdədir. Cənub tərəfdən Arduşlu, cənub-qərbdən Fərraş, qərbdən Köhnə Çorman, şimal-qərbdən Xaçınyalı, şimal tərəfdən Kürdhacı, şimal-şərqdən Ərikli, şərqdən isə Şamkənd kəndinin ərazisi ilə həmsərhəd olan kənd meşə ilə əhatələnmiş, çay kənarında, uca dağlar qoynunda yerləşmişdir. Xeyli uzaqda isə zirvəsi ağ örpəyə bürünən sıra dağlar – Qırxqız görünürdü.

Bozdağanda yayın cırhacırında axşam düşəndə günəş uzaqlarda görünən şiş uclu dağ zirvəsinin arxasına çəkilib, sanki Dəlidağda axşamlamağa gedərdi. Axşam toranı düşər-düşməz hava o dərəcədə soyuyardı ki, pencəksiz keçinmək olmurdu. Gecə isə yataqda yorğansız ötüşmək mümkünsüz idi.

Bozdağan kəndinin ərazisində olan hər bir yer, yurd adları bu kəndin özünəməxsus xüsusiyyətləri, tarixi, coğrafiyası haqqında çox şey deyir. Tək göl, Su axan, Bozun başı, Melli dərə, Cillik, Şorun Tələsi, Sarımsaqlı, Uzun Tələ, Partdama, Binə, At qoruğu, Ağdaşın arası, Xaçınyalı, Göy qaya, Ocaq qaya, Pirin yalı, Əmiçalan, Söyzalının talası, Qoruq, Qoruğun meşəsi, Qazı yeri və s. Qədim oğuzlara məxsusluğunu öz adı ilə təsdiqləyən yüzlərlə bu cür coğrafi adlar vardır.

Bozdağan kəndi özünün göz yaşı kimi dupduru, bumbuz və sərin sulu bulaqları ilə də tanınırdı. Burada mövcud olan bulaqların əksəriyyəti şəxs adları ilə bağlı idi. Buna səbəb bulaqların bir çoxunun kəndin daxili ərazisində, evlərin həyətlərində və həyət qapısına yaxın ərazilərdə olması, həmçinin meşə, tala və yamaclarda olan bulaqların abadlaşdıranın adı ilə adlandırılmasıdır. Bu cür bulaqlara Əlişin bulağı, Seyid Əlinin bulağı, Cümşüdün bulağı, Söyzalının bulağı, İslamın bulağı, Həmidin bulağı və digər bulaqlar buna gözəl nümunədir. Meşəliklər boyu gəzdikcə rast gəlinən və öz adı ilə yaxşı tanınan Qazı bulağı, Qoruğun bulağı, Ağ bulaq və başqa bulaqları da qeyd etmək yerinə düşər.

Bozdağan kəndinin ərazisində sıx bulaq şəbəkəsi olmasına baxmayaraq, iri çaylar mövcud deyildir. Burada yeganə bir çay – kəndin adı ilə səsləşən Bozdağançay mövcuddur. Çayın suyunun müəyyən hissəsindən suvarma məqsədi ilə istifadə edilirdi.

Bozdağan kəndi qoynunda qərar tutduğu dağların, dərələrin landşaftının özünəməxsusluğu ilə də digər yerlərdən fərqlənir. Təpələrin güney və quzey yamaclarını ağcaqayın, göyrüş, qarağac, cökə, murdarça, qara ardıc və adi ardıc, cır meyvələrdən alma, armud, alça, yemişan, qaragilə ağacları, əzgil,

qarağat, moruq, həmərsin (itburnu və yaxud dərgil), zirinc, dovşan alması və digər kol bitkiləri bürüyüb.

Bozdağan kəndinin yamyaşıl çəmənlərdə isə istər müalicəvi, istər də qeyri-müalicəvi birillik və çoxillik bitkilərlə: çaşır, baldırğan, kəklikotu, qantəpər, qırxbuğum, qatırquyruğu, andız, quşəppəyi, kənaf, qazayağı, zəyərək, zirə, gicitkən, əvəlik, çobanyastığı, bağayarpağı, ayıdöşəyi, bat-bat, boymadərən, çiriş, xazaz, qırxbüzük və digərləri ilə zəngindir.

Sıx meşələrin tutduğu ərazilərdə vəhşi heyvanlara və quşlara əlverişli yem və sığınacaq üçün yetərincə əlverişli şərait var. Bozdağan kəndinin florası kimi faunası da zəngin və rəngarəngdir. Vəhşi heyvanlardan ayı, vaşaq, canavar, çaqqal, tülkü, porsuq, gəlincik, cüyür (əlik), çöl donuzu, dovşan, kirpi və digər vəhşi heyvanlar sərbəst şəraitdə yaşayırdı.

Meşə, yaşıl düzənlik və çəmənlərdə yaşayan quşlardan söhbət düşəndə gözlərimiz önündə minlərlə rəngarəng təəssürat canlanır. Zığ-zığ, qaratoyuq, ağacdələn, şanapipik, cur-cur, bülbül, bayquş, sərçə, qaranquş, qartal, quzğun, qızılquş, qırğı, çobanaldadan, bildirçin, alacəhrə, qırmızıdöş, alabaxta, arıquşu, qarğa, alaqarğa, çalağan, sar və digər quşlar bu ərazilərdə məskən salıbdır.

Mürəkkəb relyefi olan bu yerlərin sərt iqlimi öz təsirini bütün amillərdən əsirgəmir. Burada iqlim yayda sərin, qışda soyuq olduğundan burada orta illik temperatur 01°C ilə 08°C arasında dəyişir. Yağıntıların illik miqdarı 700-800 mm-ə qədər olur.

**Camaatın ictimai həyatı:** Bozdağan kəndi hər zaman sayılan-seçilən ağır kişiləri, ağbirçəkləri, ismətli qız-gəlinləri ilə fərqlənirdi. Ən başlıcası isə Bozdağan Tanrı payı kimi qonaqsevərliyi ilə hamının iftixarı olub.

Kənd əhalisi milliyyətcə Azərbaycan türklərindən ibarətdir. Əhalinin əsas hissəsini oğuz türklərinin salur boyundan təkəli (təkə-türkmən) tayfasının bir qolu olan Hacısamlı elinin Qasımuşağı tayfası təşkil edir. Kənd əhalisi Məmişlər, Məmmədlər, Mikayıllar, Seyidlər kimi tirələrdən ibarət idi.

Əslən Həmdullah Qəzvini (1281-1346) özünün "Nüzhətül-qülub" kitabında Azərbaycanın beş böyük və abad şəhərləri sırasında adını qeyd etdiyi Gərgər (digər mənbələrdə Qarqar//Herher//Karkar//Xarxar) mahalından olan və XVIII yüzilliyin sonlarında Qasımuşağı obasına pənah gətirmiş iki qardaş – Seyid Ağa və Seyid Bayram Bozdağanda, Qasım Hacısam oğlunun razılığı ilə məskunlaşır. Qasımuşağı obasında yaşamağa başlayan qardaşlar az vaxt ərzində bu ərazilərdə çox böyük nüfuz qazanırlar. Hər iki qardaş teyyül-ərz məqamına malik olan övliyalardan olmuşdur. Bir sıra möhtəşəm kəramətləri olmuşdur.

Burada ömür-gün sürən hər iki qardaş Kürdhacı kəndində dəfn olunub. Məzarın başdaşı tez-tez his olurmuş. Yadımdadır, məzarların üzərində olan

mərmər daşlar tamamilə dağıdılmışdır. Hətta başdaşılarının üzərindəki yazılar belə yox idi. Ətraf kəndlər də daxil olmaqla nəzir-niyaz deyən hər kəs niyyəti qəbul olunduqdan sonra nəziri başdaşının dibinə qoyardılar. Bunun nəticəsində başdaşının dibində torpaq hissədə çox da dərin olmayan ortabab bir çala əmələ gəlmişdir.

Bəlkə də bu böyük şəxsiyyətlərin üzünün nuru hesabına kənddə insanlar bütövlükdə, islami dəyərlərlə nəfəs alır, təhsilə daha çox önəm verirdi. Sovet hökumətinin qadağalarına baxmayaraq, bu kənddə bütün dini ayinlər və qədim milli adət-ənənələr yerli-yerində icra olunurdu.

Kommunistlərin fitvası ilə kolxozlaşma dövründə aparılan repressiya zamanı Bozdağan əhalisi də bir çox çətinliklərlə üzləşdi. Kənd əhalisinin tərkibində seyidlərin olmasına baxmayaraq Qasımuşağı obasının digər kəndlərində olduğu kimi camaatın xeyli fəallıq göstərməsi səbəbindən repressiyalar dövründə bir nəfər kənd sakini Məmmədov Hümbət Məmmədalı oğlu “xalq düşməni” hesab edildi. Gizli işğalçılıq siyasəti yeridən bolşevik kələkbazlarının amalı, fikri və əməli ilə heç cür barışa bilməyən, öz yaşayış tərzini yaxşılaşdırmağa çalışan Hümbət kişi əvvəlcə çək-çevirə salınaraq qolçomaqların siyahısına əlavə edildi və zorakı kolxozlaşdırma dövrü başlayar-başlamaz müsavata üzv olduğu iddia olunaraq sürgünə göndərildi. Sonrakı taleyi məlum olmayan və sürgündən geri dönməyən Hümbət Məmmədova çox sonralar Sovet hökuməti tərəfindən bəraət verildi.

Lap əvvəldən kənddə böyüyə-kiçiyə hörmət və qayğı çox yüksək səviyyədə olmuşdur. Sovet hakimiyyəti dövründə uşaqdan-böyüyə hamı Seyid Məşədi ağanın ocağını ziyarət edərdi. Elliklə hamı deyərdi ki, Seyid Məşədi ağanın cəddini çağıran heç vaxt darda qalmayıb. O, məclisə daxil olanda hamı ayağa qalxardı. Qurani-Kərimdən surələr oxuyanda, mərsiyə deyəndə, hədis söyləyəndə məclis üzvləri bir nəfər kimi onu dinləyərdi.

Repressiya dövründən fərqli olaraq İkinci Dünya müharibəsi zamanı Qasımuşağı obasının özəlliklə üzləşdiyi fəlakət və itkilər Bozdağan kəndindəndə yan keçmədi. Məmmədov Qara Əliş oğlu, Məmmədov Əli Əliş oğlu, Bayramov Lətif Mahmud oğlu Böyük Vətən müharibəsinin alovlandığı ilk dövrlərdən könüllü olaraq müharibəyə yola düşmüş, cəbhənin qızğın döyüşlər gedən hissələrində layiqincə iştirak etmişdir. Kənddə, arxa cəbhədə qalan yaşlı insanlar, qadın və kiçik yaşlı uşaqlar ön cəbhə üçün işləyir, qələbənin təmin olunmasına çalışırdı.

Azərbaycanlı mülki əhaliyə qarşı xüsusi qəddarlığı ilə ad-san qazanan Ermənistan Respublikası Silahlı Qüvvələri tərəfindən başlanan və Qarabağ müharibəsi kimi tarixə düşən bu savaşda Bozdağan kəndinin igidləri içərisində də öz sözünü silahı ilə söyləyən Vətən oğulları oldu.

Kənd əhalisinin ətraf kəndlərdən fərqli və ən xarakterik xüsusiyyətlərindən biri də kənd əhalisinin sovet dönəmində təhsilə olan marağının artması olmuşdur. Həmin dövrdə Bozdağan kəndində ilk ali təhsil alan Məmmədov Musa Həmid oğlu, Məmmədov Möhübbət Azay oğlu, Qasımov Kamal İslam oğlu və Mikayılov Qənbər, Saday, Ənvər Hidayət oğlu qardaşları olmuşdur.

Uzun müddət kənd soveti sədri, kolxoz sədri kimi məsuliyyətli işlərdə çalışan Məmişov İslam Qasım oğlu yaxın və uzaq ərazilərdə yetərincə tanınırdı.

Əvvəllər kənd Binə adlanan ərazidə qərar tuturdu. Sovetlərin işğalından sonra kollektivləşmə dövründə əhali indiki ərazidə cəmləndi. Bu zaman əhali 27 ailədən ibarət idi. 2010-cu il yanvar ayına olan məlumata əsasən kənd sakinlərinin sayı 275 nəfər (67 ailə), 2015-ci ilin yanvar ayında aparılan siyahıyaalma zamanı isə kənd sakinlərinin sayı 289 nəfərdir (69 ailə).

**Əhalinin məşğuliyyəti:** Heyvandarlığın, əkinçiliyin inkişafı üçün bol suyu, münbit torpağı olan ərazilərdə yerləşməsinə baxmayaraq, Qasımuşağı obasının ərazisindəki digər kəndlərdən fərqli olaraq burada şəxsi heyvandarlıq sahəsi aşağı səviyyədə inkişaf etmişdir. Buna səbəb isə kənd əhalisinin əsas hissəsinin Nağdalı kəndində təşkil edilmiş sovxozda müxtəlif işlərdə çalışması idi.

Sovxozun təşkilindən sonra otlaqlar, əsasən də yaylaq ərazilərinin əksəriyyəti Nağdalı kəndinin ərazisində cəmləndi. Heyvandarlığa artırılan diqqət nəticəsində torpaqlardan əsasən biçənək və otlaq sahəsi kimi istifadə edilirdi. İlin isti dövründə 500-600 mm-ə qədər yağıntı düşməsi və onun da 60-70 faizinin yazda və yayın əvvəllərində yağması dəmyə əkinçiliyi yaxşı inkişaf etdirməyə imkan verirdi.

Əkinə yararlı sahələrdə buğda, arpa, vələmir, darı və başqa dənli bitkilər, eləcə də çoxillik yem bitkiləri becərilirdi. Bu ərazilərdə hevandarlığın inkişafı üçün əvəzedilməz yaylaq və otlaq sahələrin çox olması səbəbindən təbii ot biçənəklərinə daha çox üstünlük verməyə çalışırdılar.

Kənd sakinlərinin bir hissəsi bağ və bostançılıqla məşğul olmaqla yanaşı meşədə bitən cır meyvə və giləmeyvələrdən meyvə qurusu (qax) hazırlayır, müxtəlif məqsədlər üçün istifadə edirdilər. Dərman bitkilərinin və qida üçün mühüm əhəmiyyət xarakterli bitkilərin toplanması da əhalinin məşğuliyyət növlərindən biri idi. Bunlarla yanaşı əhalinin kömür və əhəng yandırmaqla məşğul olması ilk növbədə onların öz tələbatlarını ödəmək olmuşdur.

Heyvandarlıqla məşğul olan kənd əhalisinin əsas hissəsi yaz gələr-gəlməz Qırxqız yaylağına köç edər, bütün yay və payız fəslini yaylaqda keçirərdi. Ətraf kəndlərlə birlikdə Bozdağanda da heyvandarlıqla məşğul olan

kənd əhalisinin bu sahəyə marağı hər zaman olmuşdur. Bu sahə əhalinin heyvandarlıq məhsulları ilə tam təminatının ödənməsi ilə yanaşı onların həyat səviyyəsini yaxşılaşdırırdı. Hələ XVIII yüzilliyin ortalarından başlayaraq Qasımuşağı obasında toxuculuğa olan maraq və bu sahənin inkişafı Bozdağan kəndinin iqtisadiyyatına da öz təsirini göstərdi. Əhali toxuculuğu inkişaf etdirməklə keçən əsrin ortalarına qədər bu sahədən şəxsi dolanışıqlarını yaxşılaşdırmağa çalışırdılar.

Azərbaycan Respublikasının yaxın keçmişinə nəzər salanda mənfur erməni qonşularımızın zaman-zaman torpaqları işğal etməklə yanaşı qanlı qırğınlar törətdiyini görürük. İstər 1905-1918-ci illərdə, istərsə də ondan sonrakı dövrdə onların apardığı işğalçılıq siyasəti nəticəsində digər ərazilərimizdən fərqli olaraq Zəngəzur qəzası Hacısamlı nahiyəsi Qasımuşağı obasının ərazisi döyüş meydanına çevrilmədi. Bu isə Xosrov bəy və Sultan bəy Sultanov qardaşlarının aktiv fəaliyyəti nəticəsində baş verdi.

Erməni quldurlarının törətdiyi soyqırımın yaraları tam sağalmamış, XX əsrin sonlarında yeni bir soyqırım cinayətinə əl atdılar. Əvvəlkilərdən fərqli olaraq bu dəfəki hücum nəticəsi Qasımuşağı obası üçün keçən əsrin əvvəlində baş vermiş hadisələrdən tam fərqli oldu. Bəli, 29 may 1992-ci ildə Laçın rayonunun sonuncu dayaq məntəqələri ilə birlikdə Bozdağan kəndinin ərazisi tam işğal edilərək evlərin bir çoxu yandırıldı.

Azərbaycan Silahlı Qüvvələri tərəfindən yenidən azad edilən kənddə yaşayış yenidən bərpa edilsə də, 2 aprel 1993-cü il tarixdə Kəlbəcər rayonunun işğalından sonra mühasirədə qalan sonuncu kənd sakinləri məcburən rayon ərazisini tərk etdilər. Beləliklə kənd sakinlərinin həyatına yeni bir dövr – məcburi köçkünlük həyatı qədəm qoydu.

Bozdağan kənd sakinləri ilə həmsöhbət olduğum zaman onların nə qədər soykökə, vətənə, yurda bağlı olduqlarını açıq-aşkar sezdim. Bu insanların bir tək arzusu var: “Yenidən doğma yurda, ana vətənə, Laçına, Bozdağana dönmək!!!” Görəsən onlar bu arzuya, bu kama nə zaman, hansı vaxt yetəcəklər?

İllər ötür, zaman dəyişir, həyata yeni-yeni nəsillər gəlir, amma illərin sükutunu pozmayan və heç zaman dəyişilməyən bir məsələ, keçmiş tarixin qara ləkəsi, heç bir zaman bir para insanların həyatından silinməyəcək – “Məcburi köçkün!”, “Qaçqın!” damğası.



**Sultan HÜMBƏTOV**

**YAXŞI ADAMLAR**



**Kamil VƏFADAR**

## QƏLƏNDƏR HƏKİM

*Bir qəlbin tarixi bir xalqın tarixi qədər qədimdi, zəngindi.*
*M.C.Paşayev*

"Vətən haradan başlanır" sualına hələ də yekdil cavab verilməyib. Vətən ayaq-baş, dağ-aran, şoran-çəmənzar çeşidinə bölünməz. Vətən Vətəndi. Göy üzünə millənən Baba dağı, Şah dağı, Dəli dağı, Murovu, Çalbayırı, ...göz işlədikcə uzanan Muğanı, Mili, kürəkləri başı qarlı azman dağlı, ətəkləri bərəkətli süfrə kimi dolu düzəngahlı Qarabağı, Şirvanı birləşəndə Vətənləşir. Beləcə, yurdlar birləşib Vətən olur, yurddaş birləşib vətəndaş.

İnsan vətəndaş olanda həm də vətən olur. Mənim nəzərimcə, hər kəs Vətənin bir parçasıdır. Bütövləşdik, tamlaşdıq, qaynadıq-qarışdıq vətənləşdik. Hərəmiz anamız Vətənin bir parçasıyıq və hərəmizin içində bir vətən var.

Mənim dünyayla tanışlığım doğulduğum Oğuldərə kəndindən başlanır, – ən ucqar bir rayonun ən ucqar bir nöqtəsindən. O kənd evlərinin həyətləri çəpər, qapıları qıfıl tanımazdı. Adamları bulaq suyu kimi saf idi. Yadıma gəlir ki, Oğuldərədə buxara papaqlı, dağ ləngərli kişilər, yedditaxta tumanlı xanım-xatın nənələr vardı. Allah hamısına rəhmət eləsin! Qızları başı yaylıqlı, gəlinləri ağzı yaşmaqlı olardılar.

Oğuldərə oğlan çağlarında yaxşı oğlanlar yığmışdı başına. Aradan uzun illər keçib. Həmin adamların bir qismi haqq dünyasına qovuşublar, bir qismi isə ömürlərinin ahıl çağlarını yaşayırlar. İndi nə o yerlər, nə o çağlar var. Amma, mənim uşaqlıq, yeniyetməlik vaxtlarımdan, həm də eşidib-bildiklərimdən yaddaşımda əbədi qalmış çoxlu xatirələr var.

Əvvəlcə özümüzdən yazmaq istəyirəm. Yolu Oğuldərədən başlayıb Oğuldərədə və digər yerlərdə qurtaranlardan tutmuş, indi yurdsuz qalıb qərib məkanlara səpələnmişlərə qədər – hamıdan.

Kimdən başlayacağımı düşündüyüm anlarımda şair Məmməd İbrahimlinin Qələndər həkimə yazdığı şeiri oxudum kitabdan (qeyd edim ki, rəhmətlik şair Ağa Laçınlı da həkimə şeir həsr edib). Şeiri oxuyandan sonra həkimlə bağlı xatirələrim bir-bir canlandı gözümün önündə. Hamının qay-

ğısına qalan, hamının dərdini çəkən, özü də dərdin tufanında çapalayan bu sadə qəlbli, geniş ürəkli insandan başlamaq istədim yazımı.

**Birinci yazı**

Qələndər həkim.

– Əə, nə qarğa bazarına döndərmisiniz buranı, yol verin həkim keçsin!

Ağsaqqallardan biri haya gələnlərə təpindi. Hamı aralandı. Qələndər həkim tələsik keçib göy otun üstünə uzatdıqları oğlanın müayinəsinə başladı.

Qocaman dağlar silkinib qardan-buzdan çıxmışdı, torpağın cana gələn çağlarıydı. Bu cavan oğlan isə arandan yaylağa sürü qaldıran tərəkəmə elatından idi. Onun mindiyi at dar bir keçalatdan keçəndə, nədənsə hürküb elə oğlan qarışıq zahmandan yuvarlanıb dərin dərənin dibinə düşmüşdü.

At, ya elədiyindən peşmanmış kimi, ya canının ağrısından başını aşağı sallayıb dərənin qırağında durmuşdu. Amma ona fikir verən yox idi. Hamının diqqəti oğlandaydı, oğlan da qızıl qanın içində.

Amma bu qan elə-belə şeymiş, onun üzünü, qollarını yuvarlananda kol-kos cızıbmış, əsas məsələ o idi ki, oğlan normal nəfəs ala bilmirdi. Elə tərəkəmələrin öz dili ilə desək, ciyəri yara olan qoyun kimi içini döyürdü.

Qələndər həkim oğlanın nəbzini yoxladı, az qala həmişə qoltuğunda gəzdirdiyi qırmızı “apteçka”sından fenandeskopu çıxarıb onun ağ ciyərinin səsinə qulaq asdı (həkimlər buna auskultasiya deyirlər).

Şərti olaraq, dəniz səviyyəsində dayanıb baxsaq, bizim dağların göyün yeddi qatında dayandığını görərik. O zamankı texniki vasitələrin məhdudluğun da nəzərə alsaq, belə bir ucqar yerdə həkimlərin fəaliyyətinin ən yüksək əhəmiyyətə malik olduqlarını izah etməyə ehtiyac qalmır.

İndi mənə yaşadığım yuxu kimi, inandığım nağıl kimi görünən o çağlara, o yerlərə qayıdaq: oğuldərəlilərin Oğuldərəli günlərində kəndimizdə üç həkim vardı: Salah həkim, elə elin diliylə desək, diş həkimiydi, Sərdar həkimin iş yeri Qorçudaydı, elə həm də buna görə də hay deyəndə haya çatan birinci Qələndər həkim olurdu.

Qələndər həkim o tərəkəmə oğlanı da sağaltdı, işlədiyi uzun illər boyunca yüzlərlə, minlərlə xəstələrə də şəfa verdi. Beləliklə o, həm bir həkim kimi, həm də bir yaxşı şəxsiyyət kimi hamının sevimlisi oldu.

Nə fəslin fərqi var idi, nə də günün. Qar dizdən olanda da, çiçəklər topuğu yalayanda da üstünə hay gələn kimi qaranəfəs özünü çatdırardı xəstəyə. Sol qoltuğunda qırmızı rəngli “apteçka”sı, sağ əlində isə əl ağacı, pay-piyada.

Dağ kəndlərində buyuruğa adətən uşaqları göndərərdilər:

– Qələndər əmi filankəsin halı pisləşib...

– Qələndər dayı, filankəs yaman ağrıyır...

Uşağa qoşulub uşaq kimi qaçardı xəstənin üstünə.

Bəzən onun arxasınca yaşlı adamlar da gələrdi:

– Həkim, filankəsə güllə dəyib...

– Həkim, filankəsi bıçaqlayıblar...

Gedərdi sağaldardı... – bir daş altdan, bir daş üstdən, ağzından söz qaçırtmazdı. Elədiklərini də umacaqsız, təmənnasız edərdi.

İsti ocağının qırağından çağırıb aparardılar, şirin yuxusuna haram qatardılar, bircə dəfə alnını qırışdırmazdı, sifətini turşutmazdı, xəstənin yanına gülə-gülə girib, gülə-gülə də çıxardı.

Yeri gəlmişkən deyim ki, Qələndər həkimin özünəməxsus şirin bir gülüşü vardı. Məzəli bir əhvalatı eşidəndə uğunub gedərdi.

Dünya bir gülüşü qısqandı ona elə bil. O şirin gülüşlərin bir hissəsini gedəndə Bakir apardı özüylə, bir hissəsini Zümrüd, qalanını da Cümşüd.

Ciyərparaları o gülüşləri, param-parça eləyib özləriylə apardılar, əvəzində özləri boyda dərd qoyub getdilər.

Uşaq vaxtlarımda elə bilirdim ki, Qələndər həkim xəstəliklərin hamısının çarəsini bilir və dünyanın bütün dərdinin axarının dərmanı da qoltuğundakı o balaca qırmızı “apteçka”dadır.

...Günlərin bir günü onun gülüş dolu dodaqlarının necə səyridiyini, şəfalı əllərinin necə titrədiyini gördüm (bu Bakir öləndə olmuşdu). Hamıya şəfa verən o əllər elə titrəyirdi ki, öz doğma balasına bircə iynəni belə vura bilmirdi.

Ölənin ölüb getdiyi, qalanın qara gününün başladığı həmin gündə həmin hadisəni görəndən sonra o balaca qırmızı “apteçka” gözümdən düşdü, daha da balacalaşdı elə bil. Amma ayağım yer tutduqca, ağlım kəsdikcə Qələndər həkim daha da ucaldı, daha da müdrikləşdi mənim nəzərimdə. Çünki, o təkcə həkim yox, həm də yaxşı insandı.

Günlər ayları, aylar illəri əvəzlədi. O elli-elatlı, obalı-oymaqlı çağlar uzaq illərin o üzündə qaldı. Qələndər həkim indi doğulduğu yurddan uzaqlarda ömrünün ahıl çağlarını yaşayır. Şükür ki, qollu-budaqlıdı, nəvəli-nəticəlidi. Həmişə xeyirxahlığa tələsən, hamının qayğısına qalan həkimin qayğısını, qarğaşasını çəkən vəfalı ömür-gün yoldaşı var: Şahpəri xaladan danışıram, xanım-xatın bir qadından. Bəs necə?! Əhəd müəllim kimi bir kişinin, Zəhra xanım kimi bir qadının övladı başqa necə ola bilər ki?..

Bax belə! Həkim haqqında hələlik bu qədər.

***Birinci yazının sonu***

**(Ardı var)**

**ABİTURİYENT – 2016**

## YÜKSƏK BAL TOPLAYAN LAÇINLI ABİTURİYENTLƏR

***Bu gənclər Ağcabədinin qış yataqlarında və Azərbaycanın digər bölgələrində məcburi köçkünlük həyatından doğan bütün çətinliklərə baxmayaraq usanmayan, mübarizə aparan, gələcəyimizi aydınladan gənclərimizdir. Hər biri fəxrimiz, qürurumuz və ümidimizdir.***



**Səfərli Məhəmməd Elbrus oğlu**

15 yaşlı abituriyent Laçın rayonunun Hacısamlı kənd sakinidir. III ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 692 bal toplayaraq yüksək nəticə göstərib. Onu 700 baldan sadəcə bir sual ayırır.



**Süleymanlı Fidan Rizvan qızı**

Laçın rayonunun Qarıkaha kənd sakini, 2 saylı Laçın şəhər tam orta məktəbin məzunudur. Ali məktəblərə qəbul imtahanında 670 bal toplayaraq yüksək nəticə göstərib.



**Quliyeva Süsən Bakir qızı**

Laçın rayonunun Vağazin (Kalafalıq) kənd sakinidir. I ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 665 bal toplayaraq yüksək nəticə göstərib.



**Hüseynzadə Səfyar Rasim oğlu**

Laçın rayonunun Ağanus kənd sakinidir. IV ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 661 bal toplayaraq uğurlu nəticə göstərib.



**Qamboyzadə Vüsal Həmid oğlu**

Laçın rayonunun Bozlu kənd sakinidir. Ali məktəblərə qəbul imtahanında 654 bal toplayaraq uğurlu nəticə göstərib.



**Mayılzadə Asiman Elxan oğlu**

Laçın şəhər sakinidir. I ixtisas qrupu üzrə ali məktəbə qəbul imtahanında 650 bal toplayaraq yüksək nəticə göstərib.



**Əmioğlular Cabbarov Rəşad Etiqad oğlu və Cabbarov Xəzər Azər oğlu**

Laçın rayonunun Xırmanlar kənd sakinləridirlər. II ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında Xəzər 644 bal, Rəşad isə 471 bal toplayaraq uğurlu nəticə göstəriblər.



**Süleymanov Elvin Şahin oğlu**

Laçın rayonunun Əhmədli kənd sakinidir. II ixtisas qurupu üzrə ali məktəblərə qəbul imtahanında 634 bal toplayaraq uğurlu nəticə göstərib.



**Güləliyeva Fidan**

Laçın şəhər sakini III ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 627 bal toplayaraq uğurlu nəticə göstərib.



**Məmiyeva Gülsüm Nəsir qızı**

Laçın rayonunun Nağdalı (Şamkənd) kənd sakinidir. III ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 625 bal toplayaraq uğurlu nəticə göstərib.



**İsmayılov Elvin Rövşən oğlu**

Laçın rayonunun Ağanus (Turşsu) kənd sakinidir. III ixtisas qrupu üzrə keçirilən ali məktəblərə qəbul imtahanında 624 bal toplayaraq uğurlu nəticə göstərib.




**Əlişzadə Kənan Şəmşir oğlu**

Laçın rayonunun Qarakeçdi kənd sakinidir. III qrup üzrə keçirilən qəbul imtahanında 622 bal toplayaraq böyük uğur əldə edib.



**Hüseynov Mirsiyaf Qaçay oğlu**

Laçın rayonunun Qarakeçdi kənd sakinidir. II ixtisas qrupu üzrə ali məktəbə qəbul imtahanında 602 bal toplayaraq uğurlu nəticə göstərib.



**Cəbiyev Çingiz İsmayıl oğlu**

Laçın rayonunun Nurəddin kənd sakinidir. I ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 600 bal toplayaraq yüksək nəticə göstərib.



**Abuzərzadə Sənan İbad oğlu**

Laçın rayonunun Qarakeçdi kənd sakinidir. IV ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanından 592 bal toplayaraq uğurlu nəticə göstərib.



**Alxanov Anar Malik oğlu**

Laçın rayonunun Ağbulaq kənd sakinidir. II ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 592 bal toplayaraq uğurlu nəticə göstərib.



**Əhmədov Əlvan Yaşar oğlu**

Laçın rayonunun Nurəddin kənd sakinidir. I ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 585 bal toplayaraq yüksək nəticə göstərib.



**Səmədov Mətin Arif oğlu**

Laçın rayonunun Pircahan kənd sakinidir. IV ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 575 bal toplayaraq yüksək nəticə göstərib.



**Qarayeva Bəyaz Teymur qızı**

Laçın rayonunun Zağaaltı kənd sakinidir. II ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 564 bal toplayaraq uğurlu nəticə göstərib.



**Məmmədova Şəmsiyyə Ayaz qızı**

Laçın rayonunun Mığıdərə kənd sakinidir. III ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 560 bal toplayaraq uğurlu nəticə göstərib.



**Abbasov Nurlan Adil oğlu**

Laçın rayonunun Əhmədli kənd sakinidir. II ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 558 bal toplayaraq uğurlu nəticə göstərib.



**İdrisli Ehtiram Rauf oğlu**

Laçın rayonunun Arduşlu kənd sakinidir. II ixtisas qrupu üzrə ali məktəbə qəbul imtahanında 550 bal toplayaraq uğurlu nəticə göstərib.



**Hacızadə Turqut Mayis oğlu**

Laçın rayonunun Qarakeçdi kənd sakinidir. II ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 540 bal toplayaraq uğurlu nəticə göstərib.



**Məmmədov Sovet Nemət oğlu**

Laçın rayonunun Qarakeçdi kənd sakinidir. I ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 540 bal toplayaraq uğurlu nəticə göstərib.



**Quliyeva Xədicə**

Laçın rayonunun Cağazur kənd sakini, Taxtakörpü tam orta məktəbinin məzunudur. II ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 530 bal toplayaraq uğurlu nəticə göstərib.



**Əsədli Samirə Əli qızı**

Laçın rayonunun Mişni kənd sakinidir. IV ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 523 bal toplayaraq uğurlu nəticə göstərib.



**Hüseynli Zeynəb Lazım qızı**

Laçın şəhər sakinidir. II ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 508 bal toplayaraq uğurlu nəticə göstərib.



**Qasımov İlkin Saleh oğlu**

Laçın rayonunun Mişni kənd sakinidir. II ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 504 bal toplayaraq uğurlu nəticə göstərib.



**Şirinov Azad Nəriman oğlu**

Laçın rayonunun Güləbird kənd sakinidir. III ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 503 bal toplayaraq uğurlu nəticə göstərib.



**Abduləzimov Ağakişi Yusif oğlu**

Laçın rayonunun Fingə kənd sakinidir. I ixtisas qrupu üzrə ali məktəblərə qəbul imtahanında 502 bal toplayaraq uğurlu nəticə göstərib.

**P.S.** *Məlumatlar "Facebook" sosial şəbəkəsindən götürülüb və yüksək bal toplayan abituriyentlərin hamısını əhatə etmir. Ona görə də bəzi yanlışlıqların olması istisna deyil. Bunları nəzərə alıb dəqiqləşdirmələrini və əlavələrini bizə göndərən oxucularımıza bəri başdan öz təşəkkürümüzü bildiririk.*

KİMLƏR KEÇDİ BU DÜNYADAN

## ŞƏRƏFLİ ÖMÜR YOLU



Adətən insan ömrünü ilin fəsilləri ilə müqayisə edib ömrün baharı, ömrün payızı kimi şərti bölümlərə ayırırlar. Hətta ömrün qışı ifadəsi də tez-tez işlədilir. Ancaq düşünürəm ki, bütün bunlar insan ömrünü, keçdiyi həyat yolunu mənalandırmaq, dəyərləndirmək baxımından işlədilən obrazlı ifadələrdir. Əslində isə insan ömrü sonsuzluqdan sonsuzluğa uzanan düz xətti, yerdən Tanrıya doğru can atan günəş şəfəqini daha çox xatırladır. Və bu düz xətt, bu şəfəq o vaxt yadda qalır, uzaqdan görünür ki, insan öz bacarığı, fəaliyyəti, əməksevərliyi, vətənpərvərliyi, zəkası ilə onu daha parlaq və görünən edir. Minlərlə, milyonlarla xəttin içində seçilmək, fərqlənmək, boy göstərmək hər vaxt hər kəsə nəsib olmur. Belə insanlar elə əvvəllər də, indi də, yəqin gələcəkdə də keçmişdən sabaha uzanan yolun aydınları olublar.

Haqqında bəhs etmək istədiyim Rafiq Həsənovu belə aydınlardan hesab edirik. Ona görə yox ki, Rafiq müəllim ömrünün altmışını – kamillik dövrünü yaşayır. Ona görə ki, 30 ildən artıqdır ki, zəkasını nur-nur, damla-damla şagirdlərə paylayır. Gələcək nəsillərin təlim-tərbiyəsində bir çoxlarına örnək ola biləcək qədər əzmlə çalışır. Zahirən çox ciddi və zəhmli görünsə də, əslində şən, zarafatçıl, ünsiyyətcil, ətrafındakılarla mehriban, qayğıkeş davranan bu insan olduqca zərif, kövrək bir ürəyə malikdir. Bəzən bunu duymaq isə o qədər asan olmur. Çünki o, ən çətin, ən mürəkkəb vəziyyətlərdə belə bunu büruzə vermir. 60 illik ömrün elə məqamları, elə anları olub ki, onu yalnız özü-özü ilə bölüşə bilər, başqa heç kəslə.

Hər şeyin pafosla ifadə olunduğu, kommunizm ideyalarının tüğyan elədiyi bir zamanda – yetmişinci illərdə yaşıdlarından fərqlənən bir gənc ətrafında baş verənləri anlamağa və analiz etməyə çalışırdı. Görünür oxumağa maraq da məhz bundan yaranmışdı. Fərq qoymadan bütün fənləri yaxşı oxuyurdu. Hər şeyi yadda saxlamağa çalışırdı. Orta və ali məktəb illəri bax beləcə axtarışda keçdi desək, yanılmarıq. Ucqar dağ rayonundan – Laçından Bakıya gəlir və həmkəndliləri arasından Azərbaycan Dövlət Universitetinə ilk o qəbul olur. O vaxtdan çox illər keçib, acılı-şirinli çox hadisələr baş verib, 30 illik müəllimlik təcrübəsi qazanıb Rafiq müəllim. Hazırda Laçın şəhər 32 saylı tam orta məktəbin direktorudur. Bu illər ərzində neçə-neçə şagirdlərə elmin sirlərini öyrətmiş, öz bilik və bacarığını

gənc nəslin gələcəyi naminə təmənnasız sərf etmiş müəllimdir, sözün əsl mənasında ziyalıdır. Bir çoxları kimi mən də Rafiq müəllimin təcrübə və tövsiyələrindən bəhrələnərək müəllim sənətinə qədəm qoymuşam. İşlədiyimiz illər ərzində biz müəllimlər ondan hələ də öyrənməyə çalışırıq. Onun idarəetmə qabiliyyətinə, öz yoldaşlarına, həmkarlarına münasibətindəki düzgünlüyün, xüsusən isə səmimiliyin çox şahidi olmuşam. Bu adam necə düşünübsə, elə də danışıb, fikri ilə sözü arasında heç bir uyğunsuzluq olmayıb. Hər bir hadisəyə obyektiv yanaşıb və bacardığı qədər insanlara köməyini əsirgəməyib. O həm də Vətənini, xalqını böyük məhəbbətlə sevən, bütün varlığıyla onlara bağlı olan bir vətəndaşdır. Onun Vətənə, torpağa bağlılığından ayrıca söhbət açmaq olardı. Əslində Qarabağ boyda nisgili olan, Laçın boyda həsrət daşıyan bir qəlbin sahibinin bu qədər Vətən sevgisində təəccüblü heç nə yoxdur. Lakin insan bütün varlığı ilə vətənpərvər olanda, bu xüsusiylə başqalarına nümunə ola bilir. Onun işğal altında olan torpaqlarımızın azad olunmasında şəxsən özünün də iştirak etmək istəyi və böyük qələbəyə inamı bizləri də ruhlandırır.

İşlədiyi kollektivdə hamı Rafiq müəllimi çox sevir, ona böyük hörmət göstərir. Bütün bunlar onun sadəliyindən, xoş rəftarından yüksək mədəniyyətindən, intellektual səviyyəsindən, ziyalılığından irəli gəlir. O, həm də gözəl ailə başçısı, yaxşı yoldaş, etibarlı dostdur. Ətrafındakı insanlar çətin məqamlarda çəkinmədən onun telefon nömrəsini yığırlar, ondan məsləhət alırlar. Onu yaxından tanıyandan sonra bu qənaətə gəlmək olur ki, o yaxşı insan, yaxşı dost olmasaydı, sözün həqiqi mənasında yaxşı müəllim də ola bilməzdi. Bu mənada yaxşı olmaq kompleksi Rafiq müəllimdə cəmlənmişdir. Onun ailəsində beş övlad böyüyüb, tərbiyələnib, ali təhsil alıblar. Bu övladların da hər biri mütəxəssis kimi cəmiyyətdə öz mövqelərini tutaraq müxtəlif sahələrdə çalışırlar. Onlarda olan qabiliyyət, bacarıq, mədəniyyət və vətənpərvərlik kimi yüksək keyfiyyətlər valideynlərinin layiqli davamçıları olmasından xəbər verir. Onlar da məhz müqəddəs müəllim peşəsini seçməklə müstəqil Azərbaycanımızın uğurlu gələcəyi naminə inamla çalışırlar.

Doğrudan da insan özünün mahiyyətindən doğan yüksək mənəvi keyfiyyətləri və nəcib əməlləri sayəsində ucalır. Məhz Rafiq müəllim kimi insanların fədakarlığı sayəsində cəmiyyət inkişaf edir, məqsədyönlü, ali ideyalar gerçəkləşir. Ona görə də belə ziyalılarımızın əhatəsində olmaq, onların zəngin təcrübəsindən bəhrələnmək, faydalanmaq lazımdır. Kollektivimiz, dostları və əzizləri adından hər kəsin dərin hörmət və ehtiramını qazanan Rafiq müəllimi 60 yaşı – ömrünün kamillik zirvəsi münasibətiylə təbrik edir, ona cansağlığı, şərəfli peşəsində yeni-yeni uğurlar arzulayırıq. Qarşıda

onu gözləyən bütün işlərində yüksək nailiyyətlər arzulayırıq. Tezliklə fəaliyyətini Laçında – doğma Kamallıda davam etdirməyi Allah nəsib etsin. Qarşıdakı neçə-neçə on illiklərdə gələcək nəsillərin inkişafı, təlim-tərbiyəsi naminə öz töhfələrini damla-damla, nur-nur paylayaraq işlərini uğurla davam etdirsin.

**P.S.** *Bu yazını Rafiq müəllimin 60 yaşı tamam olanda yazmışdım. Vaxtsız və amansız ölüm onu aramızdan tez apardı. Laçın dağlarında dünyaya göz açan Rafiq müəllim Laçınsız köçdü bu dünyadan. İyun ayı onun doğulduğu və dünyadan köçdüyü tarix kimi yaddaşlara yazıldı.*

*Xatirən həmişə qəlbimdə qalacaq. Ruhun şad olsun!*

**Bəsirə MƏMMƏDLİ**

**OVQAT**

## TANRIYA ƏMANƏT OL, ŞUŞAM

Soyuq qış fəsli, zülmət bir gecə. Göylər ah çəkir, buludlar ağlayır. İntizar nəğməsi oxuyur təbiət. Şuşa daş qəfəsdədir. Elə hey qolundakı zəncirləri qırmağa çalışır. Qəlbimə hökm edən vətən sevgisi, yurd eşqi cəsarətləndirir məni, güc verir qollarıma. “Mən Şuşamı xilas etməliyəm”, – deyərək ona tərəf yollanıram. Elə bu an qeybdən bir səs eşidilir. Bu səsdə bir doğmalıq hiss edirəm. Ona tərəf gedirəm. Nurani simalı, məğrur dayanan bu şəxs ümummilli liderimiz Heydər Əliyevdir.

Biz Şuşanı, biz Qarabağı azad edəcəyik. Azərbaycanın zəfər səsi bütün dünyaya, kainata yayılacaq.

“İrəli bax!” – deyir bu səs mənə. Tezliklə bu körpüdən keçib gedəcəyik Qarabağımıza. Sevincimdən elə sürətlə qaçaraq keçirəm ki, bu körpüdən. Bu körpünün hər qarışı vətən eşqindən tikilib sanki. İrəli gedirəm. Qarşıda gözəl bir mənzərə açılıb.

Cıdır düzü, Topxana meşəsi insan izdihamına şahidlik edir. Xarıbülbülün ətri, təbiətin palitrası, al-əlvan rənglərin parıltısı, quşların ecazkar səsi göz oxşayır. İsa bulağından süzülüb gələn dürr kimi su dərdimizi, qəmimizi yuyub aparır. Qarabağ şikəstəsini dinləyirik. Uzun ayrılıqdan sonra yenidən vətənimizin torpağına ayaq basmaq nə böyük səadətdir, ilahi! Anamız kimi qoynuna alır, əzizləyir bizi ana vətənimiz. Qələbənin sevinci ürəklərimizə xoşbəxtlik toxumlarını səpir.

Güllər, çiçəklər füsunkar təbiət mənzərələri də sanki xoşbəxtliyimizə şərikdirlər. Onlar da sevincimizə şahidlik edir.

Qəfil bir səs məni yuxudan oyadır, televizorun səsi. Mavi ekran. Diktor qız xəbərlər proqramını təqdim edir.

"Bu gün Şuşanın işğal olunduğu gündür" cümləsi bir andaca məni öz təsiri altına alır. Qəhər boğur məni. Yuxumdakı Şuşanı xatırlayıram. "Məni xilas edin", – deyə qolundakı zəncirləri qırmağa çalışırdı vətənim. Fəqət, o yuxunun sonunu xatırladıqca inamım artır, qəlbimdəki ümid çırağı yanır. Ümummilli liderin sözləri yadıma düşür. "Biz Şuşamızı azad edəcəyik".

Şuşam, sənə məktub yazıram. Bu məktubu tezliklə oxuyacağına inanıram.

Ey vətən, anamız qədər doğma, vətən! Dilimizdə ən müqəddəs kəlməmiz sən, sevgiylə döyünən ürəyimiz sən, damarlarımızdan axan qanımız sən.

Sənsiz çox darıxmışıq. Torpağın, daşın üçün. Sənin hər qarışın üçün.

Ciyərlərimizə çəksək Qarabağın havasını üşüyən ruhumuz isinər bir andaca.

Sübut et dünyada öz varlığını,
Daim zirvələrdə ol, Azərbaycan!
Fitnəkar siyasət yeridənlərə
Layiqli cavabın ver, Azərbaycan!

Hicran birdəfəlik yad olsun sənə,
Qələbə Qarabağa aparsın səni.
Üçrəngli bayrağın qürur hissiylə
Əbədi zirvəyə ucaltsın səni.

Bilirəm, sən də yolumuzu gözləyirsən. Övladlarından ayrı düşən ananın fəryadını, naləsini anlamaq çətin deyil ki.



Səbir et, Şuşam! Qəlbimizə hökm edən vətən sevgisiylə, vətən eşqiylə sənə doğru gələcəyik. Həsrətin bitdiyi, vüsalın başladığı yerdə görüşəcəyik. O vaxtadək Tanrıya əmanət ol, mənim Şuşam!

**Günel ƏLİYEVA,**
***Laçın rayonu, E. Əliyev adına Fərəcan kənd tam orta məktəbinin Azərbaycan dili və ədəbiyyat müəllimi***

**TARİXİ ŞƏXSİYYƏTLƏR**



## QARABAĞDA BAŞLAYIB İSTANBULDA BİTƏN HƏYAT HEKAYƏSİ – FİRUDİN BƏY DARYAL

Azərbaycan xalqının milli mübarizə tarixinin ən şanlı səhifələrindən biri heç şübhəsiz ki, cümhuriyyət dönəmidir. Cümhuriyyət tarixi və cümhuriyyət mühacirlərinin sonrakı məşəqqətli həyatı, xalqımızın azadlığı uğrunda apardıqları mübarizə, 1988-ci ildə xalq hərəkatının başlamasından sonra bir çox tarixçilərin və araşdırmaçıların diqqət mərkəzində olmuşdur.

Uzun illər aparılan araşdırmaların nəticəsi olaraq, mühacirlərin bir qismi haqqında xeyli məlumatlar əldə edilmiş, haqlarında çox danışılıb, xeyli məqalələr və kitablar yazılmışdır. Ancaq bütün bunlara rəğmən nə yazıq ki, cümhuriyyət mühacirlərinin bütününü əhatə edəcək ciddi bir araşdırma aparılmamışdır. Bu gün araşdırılmayan olduqca çox mühacirimiz vardır ki, onların arasında Türkiyə ordusunda albay və general rütbəsinədək yüksələn Azərbaycan Cümhuriyyəti ordusunun zabitləri də vardır. Onlardan biri də Türkiyə Silahlı Qüvvələrində albay rütbəsinədək yüksəlmiş Firudin bəy Daryaldır.

Firudin bəy Daryal 1901-ci ildə Zəngəzur qəzasının Hacısamlı nahiyəsinin (indiki Laçın rayonu) Təzəkənd kəndində anadan olmuşdur. Əsl adı Fərman olsa da mühacirət dönəmində sovet təhlükəsizlik orqanlarının təqibindən qorunmaq üçün digər mühacirlər kimi adını dəyişmək məcburiyyətində qalıb. Ad olaraq əmisi oğlu Firudinin, soyad olaraq isə kəndlərində olan “Dar yal” adlı ərazinin adını götürmüşdür.

Kiçik yaşlarından cəsarəti və qoçaqlığıyla həmyaşıdlarından fərqlənər, atlara böyük maraq göstərər, atın üzərində müxtəlif akrobatik hərəkətlər edərmiş. Firudin bəy Kazanda hərbi məktəbdə təhsil almışdır. Daha sonra Azərbaycan Cümhuriyyəti ordusunun süvari alayında xidmət etmiş, alayın tərkibində Qarabağda gedən döyüşlərə qatılaraq, Şuşanın erməni daşnaklarından azad edilməsində iştirak etmişdir. Rəvayət olunur ki, Şuşada gedən döyüşlər zamanı Azərbaycan Ordusunun mövqeləri yüksəklikdə olan erməni-daşnak dəstələrinin mövqelərindən pulemyot və top atəşinə tutulurmuş. Kəşfiyyatçıların verdiyi məlumatlardan bəlli olur ki, bir erməni zabiti bir neçə gündən bir ətrafında əsgərlərlə ağ atın belində həmin mövqelərə gedərək baxış keçirir. Firudin bəy Daryal komandanlığa ona bir ağ at

verilərsə, həmin mövqelərdə olan erməniləri zərərsizləşdirə biləcəyini deyir. Ağdamın Xındırıstan kəndinin bəylərindən birinə məxsus olan ağ atı ona verirlər. Firudin bəy Daryal ağ atın belində, ətrafında da əsgərlərlə birgə erməni zabitinin getdiyi yolla erməni əsgərlərinin yerləşdiyi mövqelərə doğru hərəkət edir. Gələnin öz zabitləri olduğunu zənn edən ermənilər heç bir reaksiya vermirlər. Və beləliklə Firudin bəy və onun əsgərləri heç bir təhlükə gözləməyən düşmən əsgərlərini anidən atəşə tutaraq məhv edirlər. 1919-cu ilin yanvar ayında keçirilən baxış yoxlaması zamanı Firudin bəyin xidmət etdiyi süvari alayı göstərdikləri igidliyə görə hərbi nazirin şəxsi təşəkkürünü alır. Yanvar ayının 15-i Qarabağın general-qubernatoru vəzifəsinə təyin olunan Xosrov bəy Sultanov Firudin bəyin igidliyinə bələd olduğu üçün onu özünə köməkçi götürür.

1919-cu ilin mart ayında Qarabağ və Zəngəzurda düşmən təhlükəsi yenidən artır. Erməni-daşnak qoşun birləşmələri martın 21-dən 22-nə keçən gecə Xankəndində yerləşən Cavanşir piyada alayının kazarmalarına qəfləti basqın edib, daha sonra Əsgəran yolunu bağlayırlar. 22 mart tarixindən etibarən Xosrov bəy Sultanovun başçılığıyla erməni generalı Dronun qoşunlarına qarşı Əsgəran bölgəsində şiddətli döyüşlər baş verir. 2 aprel 1919-cu ildə Dronun qoşunları məhv edilir. Firudin bəy həmin döyüşlərdə də igidliklə vuruşur.

28 aprel 1920-ci ildə Azərbaycan Cümhuriyyəti süquta uğrayıb bolşeviklərin işğalına məruz qaldıqdan bir müddət sonra Xosrov bəy Sultanov bolşeviklər tərəfindən həbs olunur. Firudin bəy həmin zaman Şuşada qubernatorluq binası üzərində dalğalanan üç rəngli Azərbaycan bayrağını doğma kəndi Təzəkənd kəndinə gətirib ailəsinə əmanət edir.

Firudin bəyin həmkəndlisi Arif Feyzullayev bildirir ki, həmin bayraq uzun illər gizli saxlanılır. Çox sonralar 1988-ci ildə xalq hərəkatı başlayan zaman üzə çıxarılır. Nə yazıq ki, bayraq 1992-ci ildə Laçın rayonu işğal olunan zaman ailənin bütün əşyalarıyla bərabər Laçında qalır.

Firudin bəy Daryal ailə üzvləriylə vidalaşıb yenidən Azərbaycan Cümhuriyyəti Ordusunun süvari alayına qoşulur. 24 may 1920-ci ildə başlayan Gəncə üsyanında iştirak edir. Cümhuriyyətin 2-ci ildönümünə təsadüf edən və minlərlə insanın həlak olmasıyla nəticələnən üsyan 31 may 1920-ci ildə "Qızıl Ordu" tərəfindən qəddarlıqla yatırılır. Firudin bəy Azərbaycan Cümhuriyyəti Ordusunun süvari və piyada alaylarının sağ qalan əsgərləriylə birgə, polkovnik Nuh bəy Sofiyevin və polkovnik Səməd bəy Rəfibəylinin (Sayqın) rəhbərliyiylə Araz çayını keçib İran ərazisinə daxil olurlar. İran hökumətinin silahları təhvil vermək tələbini yerinə yetirmədikləri üçün hücuma məruz qalırlar. Araz çayı boyunca Türkiyəyə doğru hərəkət edir,

lakin tabeliklərində olan ağır səhra toplarını apara bilmədikləri üçün, həmin topların çaxmaqlarını çıxararaq yollarına davam etmək məcburiyyətində qalırlar. Türkiyə ərazisinə keçdikdən sonra Əhmədbəy Ağaoğlunun Atatürkə müraciətindən sonra 1200 nəfərlik Azərbaycan süvari və piyada alayının əsgər və zabit heyəti, Kazım Qarabəkir paşanın komandanlıq etdiyi Şərq Ordusunun sıralarına qəbul olunurlar. Azərbaycan hərbi birliklərinin Türkiyə ordusuna qoşulacağıyla bağlı xəbəri 8 iyul 1920-ci il tarixdə TBMM-də ümumi hərbi vəziyyətlə bağlı çıxış edən İsmət İnönü verir. Sənədlərdən məlum olur ki, Azərbaycan birliyi 31 iyul 1920-ci ildə Həsənqalaya gəlir və yanlarında Türkiyə Ordusunun böyük ehtiyac duyduğu səhra topu çaxmaqları da olur.

Firudin bəy Daryal 56 nəfəri zabit olan 1200-nəfərlik Azərbaycan birliyinin tərkibində Türkiyənin istiqlal savaşına qoşulur. 15-ci süvari alayda bölük komandiri vəzifəsini icra edir. 1920-ci ilin payızından başlayaraq, 1921-ci ilin əvvəllərinə qədər Şərqi Anadolunun ermənilərdən təmizlənməsiylə sona çatan Doğu hərəkatında igidliklə vuruşur. Sarıqamışın, Qarsın, Gümrünün geri alınmasında iştirak edir. Savaşdan sonra Mustafa Kamal Atatürk tərəfindən "İstiqlal" ordeniylə təltif olunmaqla bərabər, həm də İstanbul şəhərində ali hərbi təhsil alır. Azərbaycan Cümhuriyyəti Ordusunda birgə xidmət etdikləri bir neçə zabitlə orduda qalaraq hərbi xidmətlərini davam etdirirlər. Sonralar həmin zabitlərdən Səməd bəy Sayqın (Rəfibəyli), Cahangir Berker, Hüseyin Turqut general, Yunus Xəzərli, Məhəmməd Ağpolad, Aslan Berkan, Baba Behbud, Saleh Aksoy, Vəli Yadigar, Osman Kazak albay (polkovnik) rütbəsinədək yüksəlir.

Firudin bəy Daryal 1925-ci ilin fevral ayında Türkiyənin güney doğusunda başlayan "Şeyx Səid" üsyanının yatırılmasında, kürd aşirətlərinin başlatdığı üsyanlara qarşı, 1926-cı ildə 1-ci Ağrı, 1927-ci ildə 2-ci Ağrı, 1930-cu ildə 3-cü Ağrı hərəkatında, 1937-ci ildə Seyid Rzanın başlatdığı "Dersim üsyanı"nın yatırılmasında iştirak edir. Sonralar yazar olan Əli Çaxmaq adlı keçmiş bir zabit Türkiyənin güney doğusunda baş verən üsyanlar haqqında "Cümhuriyyət" qəzetinin 10 mart 1981-ci il buraxılışında yazdığı məqalədə Firudin bəy Daryal haqqında xatirələrini yazaraq, onun qorxusuz, dəlisov, mərd bir zabit olduğunu və atın üzərində qeyri-adi hərəkətlər etdiyindən bəhs edir.

Türkiyə Silahlı Qüvvələrinin tərkibində bir zabit olaraq müxtəlif bölgələrdə hərbi xidmətini davam etdirərək albay rütbəsinədək yüksəlmişdir. Xidməti dövründə bölük, tabor, sonralar alay komandiri, İzmir və İstanbul şəhərlərində isə hərbi komendant vəzifələrini icra edir. General olmamasına rəğmən 1950-ci illərdə Kağızmanda vəkalətən tuqay komandirliyi vəzifəsini

icra edir. 1965-ci ildə təqaüdə çıxımışdır. Təqaüddə olarkən İstanbul şəhərində yaşayır. 1936-cı ildə “Qafqaz Almanaxı”, 1953-cü ildə isə “Kaf dağı” adlı əsərlərini yazır. Azərbaycandan və Şimalı Qafqazdan olan mühacirlərlə sıx əlaqələr quran Firudin bəy həm də Qafqaz dərnəyinin fəaliyyətlərində yaxından iştirak edir.

Firudin bəy Daryal iki dəfə ailə həyatı qurur. Birinci nikahını İstanbulda hərbi təhsil alarkən qurur. Həmin nikahdan bir oğlu və bir qızı olur. Qızı Leyya Daryal Şimali Qafqaz mühacirlərindən birinin oğluyla ailə qurur. 1985-ci ildə vəfat edir, bir qızı var. Oğlu prof. Dr Əli Murad Daryal Türkiyədə tanınmış ilahiyyatçı – alimdir. Firudin bəy ikinci nikahını çox sonralar – 1952-ci ildə qurur. Həmin nikahından övladı olmur.

1933-cü ildə Xosrov bəyin Firudin bəyə yazdığı qeyddən də görünür ki, Firudin bəy İstanbulda olarkən Cümhuriyyət mühacirləriylə, xüsusən də doktor Xosrov bəy Sultanzadə ilə sıx əlaqədə olur. Mərhumun oğlu Əli Murad Daryalla telefonla danışarkən doktor Xosrov bəylə Taksimdə bir məhəllədə yaşadıqlarını, həmin dövrdə uşaq olmasına rəğmən Xosrov bəyi və yoldaşı Lena xanımı xatırladığını bildirdi.

Firudin bəy Daryalın yaxın qohumu Səlim Səlimbəyli 1986-cı ildə uzun axtarışlardan sonra əmisini tapır. Və onunla tez-tez telefon əlaqəsi qurur. Firudin bəy 1989-cu ildə 88 yaşında vəfat edir. Cənazəsi xüsusi mərasimlə, böyük hörmət və ehtiramla Qaraca Əhməd məzarlığında dəfn edilir. Vəfat etməzdən öncə başdaşına İstiqlal savaşı qazisi, süvari albay olmasını, 1901-ci ildə Şuşa şəhərinin 25 kilometrliyində yerləşən Təzəkənd kəndində anadan olduğunu və “Arkadaş! Başı taclı, altın tahtlı dahi olsan milletin, vatanın olmadan bedbahtsın!” sözlərinin yazılmasını vəsiyyət olaraq yazır.



Məqalə üçün verdikləri dəyərli məlumatlara görə Arif Feyzullayevə, mərhumun oğlu Əli Murad Daryala, Əli Murad bəylə əlaqə qurmağıma köməklik etdiyi üçün qohumu Cem Ormana, fotolar üçün isə Səlim Səlimbəyliyə təşəkkür edirəm.

**Orxan CƏBRAYIL**

**OVQAT**

## İKİ QƏHRƏMANIN BİRGƏ KƏŞFİ

***"Qəhrəman qıtlığı ilə üzləşən millət bədbəxtdir"***
**Bertol Brext**

Şükürlər olsun ilahinin dərgahına ki, Azərbaycanın qəhrəman kasadlığı tarixən olmayıb və günümüzdə də yoxdur.



Millətimin iki qəhrəmanını eyni vaxtda kəşf etməyə gəldikdə isə mənim hisslərimi xoş mənada qıcıqlandıran bir görüş bunun ilkin səbəbidir. Belə ki, əslən Azərbaycanın Laçın bölgəsindən olan və Azərbaycan Televiziyasında işləyən Ötərxan Eltacla tanış olmuşdum və isti bir münasibət yaranmışdı. Bu tanışlıqdan çox keçmədən o, hazırladığı bir kitabı haqqında mənə məlumat verdi və kitabın təqdimatına dəvət etdi. Qeyd edim ki, bu kitabın təqdimatı çox maraqlı keçdi. Həsr olunan mövzu da diqqət cəlb edən idi, mənim daxili istəyimə çox uyğun idi. Bu toplantıdan xoş təəssüratla geri döndüm və kitabla daha dərindən – təkrarən tanış olmaq qərarına gəldim. Kitabın adı "QURD BALASI"dır – maraqlı və cəlbedicidir. İlk səhifəsində Səfəvilər dövlətinin xəritəsi verilmiş, bu dövlətin yaradıcısı Şah İsmayıl Xətainin sözlərinə istinad edilmişdir. Mənim üçün çox əziz olan Şah İsmayıla istinad da, kitabı daha cəlbedici edir. Şah İsmayıl Xətainin keçdiyi yolu azdan-çoxdan araşdıran, onun haqqında xeyli elmi yazılar yazan, onun yaratdığı dövlətin xəritəsini müstəqilliyimizin ikinci ili əllə işləyən və dərhal iki kitabımın üz qabığında verən bir vətəndaş üçün bu çox ürəkaçan idi.

Şah İsmayıl Xətai Azərbaycan tarixinin ən görkəmli simasıdır. Onu heç kimlə müqayisə etmək olmaz. Yetər ki, onun yaratdığı imperiyanın sərhədlərinə diqqət yetirəsən və Ötərxan Eltacın "QURD BALASI" kitabının üçüncü səhifəsində böyük Xətainin fikirləri ilə tanış olasan.

Böyük Şahımız söyləyir: *"Ey türk oğlu, dilinin bir kəlməsini dünyanın ləl-cəvahirinə, bir ovuc torpağını dünyanın var-dövlətinə dəyişmə, onu qoru və gələcək nəsillərə çatdır!"*

Dövlətçilik tariximizdə kişilik simvolunun sahibi Şah İsmayıl Xətaini Ötərxan Eltac seçmişsə, onun gənc olmasına baxmayaraq, kimliyindən xəbər verir. Bilin və agah olun, millət millətçi olmasa, özünün yaxşılarına dəyər verməsə, həqiqətin yanında durmasa, yaltaq və təlxəyin ağzını yummasa dövlətini və millətini itirmiş olacaqdır. Bu meyar günümüzdə daha da aktualdır, reallıqdır, qaçılmaz bir həqiqətdir.

Deyilənlərin ardınca Ötərxan Eltac Azərbaycanın şimalı ilə qərbinin də xəritəsini unutmamışdı. Lakin unutmaq olmaz ki, Cənubi Azərbaycan hazırda təkcə burada azərbaycanlılar yaşayan bölgələrdən ibarət olmayıb, günümüzün İranı ilə yanaşı digər bölgələrə də iddialı olmalıyıq, İraq, Anadolu və s.

Nəhayət, gələk şairimizin əsas məqsədi üstünə. Əsərin qəhrəmanı "Azərbaycan Bayrağı" ordenli xalq qəhrəmanı İbad Mövsüm oğlu Hüseynlidir. Şair deyir:

*Bizə əsgər lazımdır, zərbəsi dağ aşıran,*
*Sözünün kəsəriylə düşmənləri çaşıran!...*

Ötərxan Eltacın bu kitabında çox doğruluq var, səmimilik var. O, ilk olaraq xalq qəhrəmanı İbada həsr etdiyi "İbadımızın" şeirini vermiş, kitabı məxsusi bölümlərlə səhifələmişdir. Bu şeirdə deyilir:

*Özü haqdır, sözü haqq, qəlbində milli qürur,*
*Səngəri ev sanaraq keşikdə durmuş və durur.*
*Düşmənin köləsidir keçmişi hər kim unudur,*
*Onu xəlvət oyadar nərəsi İbadımızın.*

Tarixi həqiqətlər göstərir ki, özü, sözü haqq olmayan, daxilən milli qürur hissi keçirməyən istənilən əsgər səngərdə durum göstərə bilmir, səngəri özünün və ailəsinin yaşadığı bir məkan sanmayan əsgər orada uzun müddət tab gətirə bilməz.

Digər bir məqam isə kökü siyasətlə əlaqəli olmayan bir fikir də əsgəri çaşdıra bilər. Hər bir əsgərə milli maraqlara cavab verə bilən siyasəti "yedizdirməliyik". Azərbaycan-erməni münasibətlərində isə hər bir əsgərə erməni

həqiqətlərini açıqlamaq yetərlidir. Axırıncı 100 ildə ermənilərin Azərbaycan xalqının başına açdıqları müsibətlərin, alçaqlıqların, xəyanətlərin, xəbisliklərin, rəzilətlərin, hətta bir qismi yetərlidir ki, əsgərin bircə düşüncə tərzi olsun – intiqam! Həm də Ötərxanın dediyi kimi, düşmənin keçmişinin "qaraçı hay" olduğu, tarixən həmişə köləlik həyat tərzi sürdüyünü, istəyini əldə etmək üçün anasının, bacısının, arvadının və qızının namusunu məmnuniyyətlə qurban verdiyini, kişilik nə olduğunu heç zaman yaşamayan erməninin qeyrətsizliyini hər bir Azərbaycan əsgəri bilməlidir, bilməlidir ki, Azərbaycan türkü hansı xislətli bir canlı ilə üzbəüzdür. Ermənilərə mən insan deyə bilmirəm, çünki onlarda insaniyyətlik əlaməti yoxdur.

*Qonşusu erməni kəs əksə ağac verərmi bar?!*
*Bu dünya dəmir qəfəs, dərd yükümüz qatar-qatar,*
*Kükrəsə Göyçə gölü Vedibasar çalxalanar,*
*İrəvandan yayılar nəğməsi İbadımızın.*

Ötərxan Eltacın seçdiyi el qəhrəmanı İbaddır, ondan istəyi, umacağı çoxdur – ürəyinin umacağı... O, itirdiyimiz torpaqları yaxşı tanıyır, bu səhvlərimizi, ürəyi yumşaqlığımızı, güzəştlərimizi qəbul edə bilmir.

*Qaytar o dərd çiçəyim Qubadlını, Zəngilanı,*
*Ötərxan yurda asi? Qoy tutsun Haqqın Quranı,*
*Qoyma qalsın sabaha, qaytar Laçıntək qalanı,*
*Aləmə nur çiləsin çöhrəsi İbadımızın...*
*Dədə yurdum İrəvan qibləsi İbadımızın.*

Həqiqətən də Yuxarı Qarabağ, onun hər bir bölgəsi təkcə Ötərxan üçün, İbad üçün deyil, bütün Azərbaycan xalqı üçün çox böyük dərddir, unudulması mümkünsüzdür. Bu işlərimizdə də qəbahətlərimiz çoxdur, bizim heç birimizin rahat yaşamağa, nəyi isə gözləməyə, kimdənsə nəyisə ummağa haqqımız yoxdur. Vətən o vaxt vətən olur ki, vətən oğlu onu qorusun.

Ötərxan Eltac xalq qəhrəmanı İbada ikinci bir ad da verib – Qurd balası. Bu ifadənin kökünü bilmədən, o adı kiməsə vermək olmaz. Öz qəhrəmanını ikinci bir adla təltif etməsi, Ötərxan Eltacın qədim türk tayfalarının inanc yerini, şərəf yerini bilməsi ilə əlaqədardır. İstənilən halda mən belə düşünürəm və Qurd məsələsini qədim türklərdə həyat tərzi olduğunu bilirəm. Ötərxan Eltacın, "Qurd balası" şeiri, sözün həqiqi mənasında bir epopeya fikri həcmindədir, əsər qəhrəmanın keçdiyi yolu tam əhatə edir, milli insanın qanını dərhal "qaynadır".

O, Kəmər qayaya çoxsaylı müraciətlər edir – xalqının, millətinin dərdini, sərini, tarixini, milli mənəviyyatını dilə gətirir.

*Kəmər qaya!*
*Şahidsən sən*
*Öz qanıyla tarix yazan*
*İgidlərin hünərinə.*

*Kəmər qaya!*
*Şahidsən sən*
*Hər kəlməsi gövhər olan*
*Müdriklərin gövhərinə.*

Ötərxan Eltacın yaradıcılığı ilə tam tanış olmasam da, xalq qəhrəmanı İbada həsr etdiyi "QURD BALASI" əsəri onun haqqında istənilən qədər müsbət fikirlər toplumu yaratmağa imkan verir. Şeiriyyətinə müdaxilə etmədən, şairin yaradıcılıq qabiliyyətinə, fikir və düşüncələrinə biganə qalmaq mənim üçün mümkün olmadı. Onun kitabını dəfələrlə gözdən keçirdim. O, əsas işindən, seçdiyi istiqamətdən dönmədən, əsərin baş qəhrəmanı İbadı yaddan çıxarmadan təkcə Azərbaycan tarixini deyil, bütün Turan tarixini vərəqləyir.

*Köküm Çindən şaxələnib*
*Sibir, Altay*
*Yaxud Orxan-Yeniseydən.*
*Düz Altaydan Türküstana*
*mənim olub.*
*Dünyaya meydan oxuyan*
*igidim, ərənim olub...*

Deyilənləri bilmək və dilə gətirmək üçün, bu tarixi səhifələri vərəqləmək gərəkdir. Bu olmasa, qəti qərara gəlib fikir söyləmək əlbəttə ki, çətindir. O, tarixi həqiqətləri, uzun əsrlərin keşməkeşini bir neçə misrası ilə hörmətli oxucularına çatdıra bilir.

*Cəsarətim namərdlərə*
*göstərib öz həddini,*
*Namərdlər də qorxa-qorxa*
*qurublar Çin səddini.*

*Bir tərəfim Uyğurustan*
*bir tərəfim bolqar, macar*
*bir tərəfim Mosul, Kərkük*
*Əsl türkük.*

İlk baxışda bu misraların ancaq türkə, türk dünyasına həsr olunduğu təəssüratı yaratsa da, onu əsərinin qəhrəmanı İbadla birbaşa birləşdirə bilməsi istedadı da göz önündədir. O, İbadı türkün böyük xalq qəhrəmanları ilə yanbayan qoyur, onlardan ayırmır, İbadın da Turan türklərindən biri olduğunu dilə gətirir, onun soykökünü təsdiqləyir.

Ötərxan Eltac demək olar ki, tarixi qəhrəmanlarımızın hamısının adını çəkir, onların Turan tarixində qoyduqları ibrət dərslərini sadalayır, xatırladır, hər kəsə layiq olduğu dəyəri verir, İbadla sıralayır. Bunların hamısını bir yazıda cəmləmək, hər kəsə öz dəyərini açıqlamaq mümkünsüz məsələdir. Amma Turanın görkəmli qəhrəmanlarından biri, Azərbaycan imperiyasını yaratmış, dilimizi dünya miqyasında şərəfləndirmiş böyük şahımız, cavan şahımız, qısa ömür yolu keçmiş Şah İsmayıl Xətaidən ötəri keçməyi bacarmadım, bütün Turan türklərinin də bu mövqeni müdafiə etmələrini arzu edərdim. Çünki Azərbaycan Turanın mərkəzidir və səlahiyyətim olsa idi Turan Xaqanlıqlarının paytaxtını Azərbaycanın Bərdə şəhərini elan edərdim və orada hər bir türk xaqanlığının muzeyini yaradardım.

*Bir xəbər ver*
*Kəmər qaya,*
*yatma, ayıl!*
*Hanı babam!*
*Doğma dildə dövlət quran*
*14 yaşlı Şah İsmayıl*
*Sən insanda qüdrətə bax*
*Fəzilətə, fitrətə bax,*
*14 yaşda açıq olub bəsirəti.*

Buradaca Ötərxan Məhərrəm adında bir şəxsi vəsf edir və onun şərhini verir. ...Məhərrəm İbadın (əsərin qəhrəmanı) ulu babasıdır. İbadın ulu babası Məhərrəmin babasının da adı Məhərrəm olub. Şəcərənin bu gündən keçmişə doğru ardıcıllığı belədir: İbad – Mövsüm – Həsi – Məhərrəm – Hüseyn – Məhərrəm”.

*Çünki oğullara güvənir vətən*
*Oğul da atadan görüb-götürür.*
*Oğul da ki, öz oğluna ötürür*
*Beləcə, əsrlər, illər dəyişir.*

Ötərxan böyük şövq ilə xalq qəhrəmanı İbadın şəcərəsini ardıcıl olaraq, daha dərindən və dəqiqliklə sıralayır. Məhərrəm → Həsi → Mövsüm → Eyvaz, Əbülfəz, İlyas, İbad, Füzuli...

Bu şəcərənin qəhrəmanlığı ilə Ötərxan Eltac Şimali Azərbaycanla Cənubi Azərbaycanı birləşdirir, Şah İsmayıl Xətai dövlətinin sərhədlərini xəyalən də olsa cızmağa çalışır.

*Hicran adlı ayrılığın vüsalına can atıram*
*O Güneylə bu Qüzeyi xəyalımda birləşdirib*
*bir məmləkət yaradıram.*
*Odlar yurdu...*
*Oğuz yurdu...*
*Azərbaycan, Azərbaycan...*

Şair xalq qəhrəmanı İbadın keçdiyi yolu bütövlüklə və ardıcıl olaraq nəzmə çəkmişdir. Onun Sovet Ordusunda hərbi qulluqda olmasını bütün çalarları ilə, xəyalından keçənləri, davranışları, yeri gələndə əks hərəkətləri ilə özü də reallıqla işıqlandırmışdır.

*O şir – İbad adlı cəngəvər, cəsur,*
*Ondadı dəyanət, mətanət, qürur.*

İbad Sovet Ordusunda xidmət etsə də, xəyalən vətəni Azərbaycanda idi. Ona görə də ermənilərlə rusların Qarabağda alovlandırdığı müharibəyə dözmür, Vətənə qayıtmaq, düşmənin "dərsini" vermək istəyini həyata keçirir.

*Düşmən torpağıma göz dikibsə, mən –*
*Sovet Ordusunda xidmət etmərəm...*

İbad Qarakənddə, Muğanlıda, Qarabağın digər bölgələrində ermənilərlə üzbəüzdür, intiqam hissi onu rahatlanmağa imkan vermir. O, bəzən erməni gülləsinə tuş gələn yoldaşlarının intiqamını almaq üçün təkcə əməliyyat aparır və istəyinə nail olmayınca geriyə dönmür. Hətta istəyinə nail olmaq üçün atasının işlətdiyi dəyirmanı oraya doluşmuş ermənilərlə birlikdə partladır, Qaradağlıda, Xocavənddə xeyli uğurlu əməliyyatlar keçirir.

*Xocavənd qan çanağı*
*Qan azadlıq ruhudu,*
*Azadlığını qoru*
*Sanma ki, bir yuxudu.*

Xocavəndin Pirbulaq əməliyyatından sonra el qəhrəmanı İbad yollanır Şişqayaya, Xramorda... sonra isə Qaraçuxu tərəfə boylanıb quracağı planı – əməliyyatı beynində saf-çürük etdi.

*Çalışdı, çarpışdı, batdı qan tərə*
*Minanı basdırdı lazımi yerə.*

Ötərxan Eltac qəhrəmanı Qurd İbadı bir çox ölkələrdə döyüşmüş terrorçu, türk dünyasının qatı düşməni Avo ilə, daha dəqiq Monte Melkonyan ilə öz doğma kəndində qarşılaşdırır. Bu səhnə nə qədər ağır və dəhşətli olsa da, çox qürurvericidir.

Qəddarlığı ilə bütün erməni dünyasına məlum olan Avo başını türk oğlu türk İbada verməli olur. Burada bir məsələni qeyd etmək çox gərəklidir. Düşmənə cavabı öz qaydası ilə vermək lazımdır, qoy düşmən öz hərəkətinin ağrılarını hiss etsin, burada humanist olmaq yersizdir.

Qurd İbad fitnəkar erməninin başı ilə birlikdə onun üstündə olan xəritəni, cib dəftərçəsini, ailəvi şəklini, qələm və saatı da bir dəlil, sübut olaraq götürmək qərarına gəldi.

İbad Kuropatkina yaşayış məntəqəsində də çox cəsarətli addımlar atır, öz istəyinə uyğun hərəkət edir. Təəssüf ki, minaya düşür və əyləşdiyi maşın parça-parça olsa da, ağır yaralanan İbad sonda həyatda qalır, öz mübarizəsini davam etdirir. Onun bu mübarizliyi ölkə Prezidenti səviyyəsində qiymətləndirilir.

Ötərxan Eltac xalq qəhrəmanı İbad Hüseynlinin döyüş yolu ilə yanaşı, onun anadan olduğu Muğanlı kəndi, oxuduğu məktəbi, qardaşlarının, dostlarının döyüş yolunu, hansı bölgədən olmalarını, “Azərbaycan Bayrağı” ordeni ilə təltif olunmasını, xəstəxanada yatmasını, qardaşı Eyvazın özünümüdafiə dəstəsi yaratmasını, Türkiyədə müalicə olunmasını və s. böyük həvəslə qələmə almışdır. Onun öz dili ilə desək – “Dilimdən çıxan hər bir kəlmə ipəsapa düzülüb misralanırdı. Qəhrəmanımıza salamımı belə çatdırırdım”.

*Sizə bir ərzim var, ay Gülşən xanım*
*Bu ərzimi ol İbada çatdırın.*
*Min bir dərman min dərd üçün yaranıb*
*Tanrı yetər özü dada, çatdırın.*

Ötərxan Eltac hər yerdə olduğu kimi əsərinin baş qəhrəmanı Qurd İbadı – Qurd balasını Türkiyədə aldığı müalicədən sonra doğma Azərbaycanda da şən bir əhvali-ruhiyyə ilə qarşılayır, onu bu münasibətlə də vəsf edir, Vətəndə salamlayır. Vətəndə görüşə fərqli çalarla yaşayan gitara ustası Rəmiş də qoşulur, İbad Hüseynliyə qurban kəsdirir, məclis qurdurur. Şair o dərəcədə İbad Hüseynlinin vurğunudur ki, onun oğlu Alpaya da şeir həsr edir. Çox keçmədən növbəti şeiri ilə İbadın ikinci oğlu Atillanı bütün Azərbaycan cəmiyyətinə tanıdır. Təbii ki, qəhrəmanın doğum günü də Ötərxanın yaddaşından silinmir, Qurd balası üçün həmişəyaşar bir səhifə açır.

Müəllifin qeyd etdiyi kimi: “Qarabağda qanlı savaşlar başladığı andan İbad beş qardaşı ilə bərabər getdi döyüşə. O qardaşların hər birinin döyüş

yolu da yazılmayan şanlı bir tarix səhifəsidir. Elə bir səhifə ki, nəsillərə örnək ola biləcək qədər qiymətlidir".

Ötərxan Eltacın çox böyük həvəslə qələmə aldığı "QURD BALASI" əsəri bütövlükdə həm də vətənpərvəlik rəmzidir, tarixi nişanədir, elimizə, obamıza, vətənimiz Azərbaycana dəyərli bir hədiyyədir. Qoy onu oxusunlar, ibrət dərsi alsınlar, xalq qəhrəmanı İbad Hüseynliyə oxşamağa çalışsınlar.

Bir məsələni də diqqətdən kənarda qoymaq istəmirəm və fikrimi əziz oxucularıma Ötərxan Eltacın öz dilindən süzülmüş cümləsi ilə çatdırmaq istəyirəm. O, yazır: "–Yazının bu vədəsinə çatanda 2015-ci ilin qarlı, şaxtalı, çovğunlu 15 fevral günü idi. Elə bu 15 fevral tarixini yazanda yadıma düşdü ki, bu gün təvəllüd tapdığım, həyata vəsiqə aldığım gündür"...

Mən də çalışdım ki, sənin "QURD BALASI" kitabına həsr etdiyim bu yazı sənin təvəllüd gününə düşsün və sənin başqa bir mənbədən tapdığım şeirini kimliyin üçün burada verdim:

*Tor atırıq balıq düşmür, danlayırıq qarmağı,*
*Sanırıq ki, burda da var nəsə rusun barmağı.*
*Kəlbəcərim, Şuşam getdi, hanı Laçın torpağı,*
*ATƏT tale yazır Allah, yazması mənnik deyil,*
*ATƏT tale yazır Allah, yazması sənnik deyil?*

Ötərxan Eltacın əlimdə olan "QURD BALASI", yaxud "İbadnamə" əsəri İbad Hüseynlinin Qarabağ döyüşlərində göstərdiyi qəhrəmanlıqlara, onun həyat yoluna həsr olunsa da, bu əsər həm də tarixi bir kitabdır, həmişəyaşardır, oxucu üçün əvəzsiz, qiymətli mənbədir.

Qarabağ məsələsi Azərbaycan xalqının günümüzdə ən ağrılı yeridir, təcili olaraq həll olunması gərəkli bir reallıqdır.

Ümid edək ki, bütün Azərbaycan insanı toparlanacaq, təmiz türk qanlı bir sərkərdənin ətrafında cəmlənəcək, erməni və rus qoşunlarına layiq olduqları cavabı verəcək, uzun illər işğal altında qalan torpaqlarımızda uyuyan ata-babalarımızın fəryadına hay verəcək, xalq qəhrəmanı İbad Hüseynlinin, Ötərxan Eltacın və digər ərən türk kişilərimizin arzularını gerçəkləndirəcək, bütövlükdə Azərbaycan kişisinin ləkələnmiş qeyrətini suya çəkəcəkdir!... Amin!...



**Ziyadxan NƏBİBƏYLİ,**
*Azərbaycan Yazıçılar Birliyinin və*
*Azərbaycan Jurnalistlər Birliyinin üzvü,*
*Qarabağ müharibəsi veteranı,*
*yazıçı-publisist*

**MÜNASİBƏT**

## SÖZ VƏ ONUN KƏRAMƏTİ

Söz cəmiyyəti hərəkətə gətirən ünsiyyət vasitəsidir. Yaşadığımız cəmiyyəti, iştirak etdiyimiz məclisi söz gözəlləşdirir.

Sözün fəlsəfi, məntiqi duyumu var. Biz mənalı, hikmətli sözə tez vuruluruq, onu təhlil edir, onu könlümüzdə yaşadırıq. Sözün (poetik sözün) estetik dəyəri, gözəlliyi, zövqü olur. Belə söz bizi sevindirir, duyğularımıza rahatlıq gətirir, mənəviyyatımızı zənginləşdirir.

Sözün işığı var. Biz həmişə işıqlı sözün ətrafına yığışırıq.

Söz ömür – günümüzün bəzəyidir. Ona görə deyirlər ki, yersiz söz danışmayın. Yersiz söz peşmançılıq yaradır. Biz həmişə çalışırıq ki, şirin, mənalı söz danışaq.

Azərbaycan klassiklərinin hamısının əsərlərində sözə, sözün qüdrətinə aid gözəl fikirlər var. Aşıqlarımız da sözə aid gözəl şeirlər yazmışdır. Aşıq Hüseyn Cavanın, Aşıq Ələsgərin, Aşıq Şəmşirin sözə aid dəyərli şeirləri var.

Sözü çox uzatmayın, az danışın, söz danışın. Ona görə babalarımız demişdir: "Çox danışmaq gümüşdürsə, az danışmaq qızıldır". Nizami az və dəyərli söz haqqında demişdir:

*Sözün də su kimi lətafəti var,*
*Hər sözü az demək daha xoş olar.*

Sözü yaxşı və pis olmaqla iki qrupa ayırmaq olar: biri şirin söz, o biri acı söz. İnsanın şirin sözə həmişə ehtiyacı var. Şirin söz bizə ruh verir, qol-qanad verir, əhvalımızı xoş eyləyir. Şirin sözün ömrü uzun olar. Acı söz isə əksinə, ovqatımıza qəm-qüssə qatır, ağrımızı, acımızı artırır. İnsanın yaddaşında silinməz iz buraxır.

Söz haqqında, onun keyfiyyəti barəsində biz tez-tez eşidirik, deyirik, yaxud bizə deyirlər. Yəqin sizin hər biriniz – qəbahət söz, ötkəm söz, yalan söz, qırmızı söz, duzlu söz, duzsuz söz, tənəli söz, dingiş söz, yağlı söz, nəhs söz, nəsihətli söz, ağıllı söz, dəyərli söz, ikibaşlı söz, gülməli söz, dolaşıq söz, kəmsər söz, boş söz, yekə söz, bekara söz, haqq söz, iri söz, doğru söz, haqsız söz, xırda söz, odlu söz, sərt söz, qısa söz, uzun söz, axmaq söz, çürük söz, alovlu söz, havayı söz, gözəl söz, bal söz, gül söz, ara sözü, yaxşı söz, xeyirli söz, xeyirsiz söz və s. söz haqqında deyilənləri eşitmisiniz. Sözün bu keyfiyyətin nəzərə alaraq ondan ehtiyatla istifadə etmək lazımdır. Qarşınızda olan adamın təhsilinə, yaşına uyğun danışmağa çalışın.

Söz elə gücə malikdir ki, onun gücü ilə böyük bir silahlı qoşunu dayandırmaq olar. Yaxud onun gücü ilə silahları işə salmaq olar.

Böyük Şah İsmayıl Xətai söz haqqında demişdir:

*Söz var, kəsdirər başı,*
*Söz var kəsər savaşı.*

Ata-babalarımız sözün gücünü, dəyərini, hikmətini nəzərə alaraq yenə söyləmişdi:

*Söz var, səni edər vəzir,*
*Söz var, səni edər zəlil.*

Yaxud:

*Söz var, ləldir, incidir,*
*Söz var, qəlbi incidir.*

Sözün təsir gücünü görən, bilən, ulularımız deyib:

*Söz var, ata mindirər,*
*Söz var, atdan endirər.*

Bir atalar sözündə də deyilir:

*Söz var, dağa çıxardır,*
*Söz var, dağdan endirir.*

Yəni elə axmaq söz deyərsən böyük fəlakət yaranar, yaxud böyük bir qalmaqalın qarşısını sözlə kəsmək olar. Müasir dünyamızda sözün gücündən çox istifadə olunur.

Sözün insana təsiri çox böyükdür. Bir xalq mahnısında deyilir:

*Qalada yatmış idim,*
*Top atdılar oyanmadım,*
*Söz ilə, avaz ilə oyatdılar…*

Göründüyu kimi, söz topdan qüvvətli silahdı. Top səsinə yuxudan durmayan insan, şirin sözün təsiri ilə oyanır.

Sözün uşaq qəlbinə olan dəyərini də yada salmaq vacibdir. Dilbilməz bir uşaq şirin ana laylasının təsirindən sakitləşir, yuxuya gedir.

Söz bütün silahlardan güclü silahdır.

Ata-babalarımız qan davasını söz ilə kəsiblər.

Sözün hərarəti var. Söz isti və soyuq olur. Söz var, eşidəndə sevinirsən, yüngülləşirsən, söz var, eişidəndə üşüyürsən. Söz var, eşidirsən sənə ümid verir, söz var, ürəyini parçalayıb deşir. Belə acı söz haqqında atalarımız deyib: “Qılınc yarası sağalar, söz yarası sağalmaz”

Yaxşı, dəyərli sözü eşidəndə qarşı tərəfin sözünə şərik oluruq. Onun sözünə əlavə söz qatır və – “sözünə qüvvət” – deyirik. Sözünüz qüvvətli olsun.

Sözünə qüvvət!

Söz dəyərli və dəyərsiz olur. Yaxşı, mənalı söz eşidəndə söz xiridarları deyir:

_ “Kişi qızıl kimi söz dedi”. Sözünüz dəyərli olsun!

Söz düz və əyri ola bilər. Əyri söz həmişə narazılıq yaradır. Düz söz söylənilndə hamı alqış edir. Ona görə deyirlər: “Doğruya zaval yoxdu” Sözünüz düz olsun, düz söz deyin.

Söz məlhəmdi (əlbəttə yaxşı söz), işıqdı, nurdu. Belə söz adamın canına yağ kimi yayılır, ruhumuzu yüngülləşdirir.

Söz ovqatımıza dəyərindən asılı olaraq yaxşı və pis təsir göstərir.

Söz çiçək kimi, gül kimi təravətə malikdi. Yaxşı söz eşidəndə deyirlər:

“Lap gül kimi söz danışdı.” Sözünüz ətirli olsun!

Söz baldı, şəkərdi, dadlıdı, tamlıdı. Siz də xoş söz deyin. Sözünüz həmişə şirin olsun!

Söz rəngdi, onun cürbəcür sayası var. Ona görə biz səhv sözü “qırmızı yalan”, “qara yalan”, “ağ yalan” və s. adlandırırıq. Atalar deyib: “Yalan söz üz qızardar”. Burada sözün üz qızartması pis əlamətdir.

Söz məhəbbətdi, sevgidi, ünsiyyətdi, ülfətdi, nifrətdi... Ünsiyyətli, məhəbbətli söz danışın, hamının yanında hörmətiniz olsun, hamının sizə məhəbbəti olsun.

Söz müxtəlif fərdlərə malikdir. Söz var, kişi sözü, mərd sözü, söz var, namərd sözü. Kişi sözü o sözdü ki, deyilir və ona əməl edilir, o sözdə xeyir var. Namərd sözü qan qaraldır, heç kimə xeyir vermir.

Söz ləziz yemək kimidi. Onu ağızda elə bişirib-düşürmək lazımdır ki, eşidənlər o sözdən razı qalsın, onun ləzzətini hiss etsin.

Yaxşı söz adamın özünə də yaxşı təsir bağışlayır.

Sözün miqdarı, kütləsi, ağırlığı var.

Bizim qəlbimizə dəyən kobud, acı sözlərə “ağır söz” kimi ad veririk. Bəzən danışan yoldaşımıza deyirik: Bəsdi, acı-acı danışma.

Söz müəyyən sərhədə, əhatəyə malikdir. Ona görə yersiz söz danışanda adama deyirlər:

– Yersiz danışma, sözünə sərhəd qoy! Yersiz söz baş ağrıdar.

Bayatı ustası Sarı Aşıq demişkən:

*Ya məclisdə lal otur,*
*Ya dinirsən dürüst din.*

Sözünüz kişi sözü olsun. Söz sərhədini keçməyin. Verdiyin sözə çalışın əməl edin. Sözə əməl etmək hünərdəndir.

Sözün qanadı var, yaxşı söz bir anda ellərə yayılır, dildən-dilə düşür. Ondan yeri gəldikcə istifadə olunur.

Deyirlər söz müqəddəsdi, göydən gəlib. Bu doğrudan da belədir. Qurani-Kərimdə olan surələr, ayələr hamısı haqq sözüdür. O, bizlərə Tanrı tərəfindən ərməğan olmuşdur. Buradakı sözlərdə şəfa var, nur var, həyat var. İnsanlığa aid olan bütün müsbət keyfiyyətlər var.

Babalarımız deyib: – Ulu sözünə baxmayan, ulaya-ulaya qalar. Uluların sözünə əməl edin. Sözünüzün yerini bilin. Heç vaxt, harada olur olsun, heç bir məqamda pis sözünüzü əvvəl söyləməyin. Həmişə, hər yerdə yaxşı söz danışın. Qoy sözünüz sizi ucaltsın, yaddaşlarda yaşatsın!



**Bəxtiyar KAVANLI**

**KİTAB RƏFİ**

## “MƏNƏ DAĞ ÇƏKƏN DAĞLAR”




Bu günlərdə "Mənə dağ çəkən dağlar" adlı şeirlər kitabı nəşr olunub. Elbrus Abbasovun yeni çapdan çıxmış ikinci kitabı bu adla işıq üzü görüb.

Məlumat üçün bildirək ki, Elbrus Abbasovun bundan öncə “Xəyalım yön alıb yenə Laçına” adlı kitabı işıq üzü görmüşdü. “CBS-PP” nəşriyyatında çap olunan yeni kitab 312 səhifə həcmində, 500 tirajla nəşr olunub.

Qeyd edək ki, Elbrus Xaspolad oğlu Abbasov 1946-cı il may ayının 16-da Laçın rayonunun Daşlı kəndində ziyalı ailəsində anadan olub. 1963-cü ildə orta məktəbi bitirib və həmin il AKTİ-nin baytarlıq fakültəsinə qəbul olub. 1968-ci ildə institutu müvəffəqiyyətlə bitirərək təyinatını doğma Laçın rayonunda çalışmaq üçün alıb. Rayonun Kürdhacı, Cağazur, Qoşasu və Şəlvə baytar məntəqələrində müdir olub. 1977-ci ildən 1987-ci ilə qədər Daşlı sovetində sədr, 1999-cu ilin dekabr ayına kimi “Jdanov” adına sovxozda direktor, “Nəsimi” adına kolxozda sədr vəzifəsində çalışıb. 2010-cu ilədək isə məskunlaşdığı Ağsu rayonunun Gürcüvan kəndində bələdiyyə sədri seçilib. Poeziyaya həvəsi orta məktəbdə oxuyandan yaranmış, yazdığı şeirləri ən yaxınlarına oxumaqla kifayətlənmişdir. Rayon və respublika mətbuatında dəfələrlə şeirləri çap edilib. Şeirlərinin bir hissəsi yeni çapdan çıxmış “Mənə dağ çəkən dağlar” kitabında toplanıb. Sonsuz vətən həsrəti, o dağları, bulaqları yenidən görmək, ata-baba qəbirlərini ziyarət etmək arzusu ürəyinə hakim kəsilmişdir. Dostlarla sədaqətli, elinə, obasına məhəbbətli, xalqını sevən, ailəsinə, ətrafına böyük qayğı göstərməklə bərabər, həm də tələbkarlığı ilə fərqlənən müdrik bir ağsaqqaldır. Bu keyfiyyətlər bütün yazılarında qabarıq hiss edilir.

Elbrus Abbasov deyir ki, “məni xalqıma, Prezidentimə və orduma olan inamım və məhəbbətim yaşadır. O dağları görməsəm, o bulaqlardan su içməsəm, dostlarla Şəlvə dərəsində adıyla məşhur bulaqların üstündə qonaqlıqlar verməsəm ölmərəm, mən o günü görmək üçün yaşayıram”.

İnanırıq ki, o günlərə az qalıb, Elbrus müəllim!

Tanrı özü qismət etsin!!!

**Ramil CƏBRAYIL**

**ARAŞDIRMA**



**Yusif OTAYLI**

## GƏLMƏ KƏLMƏLƏRDƏN SEÇMƏLƏR

Son 20-25 ildə dilimizə xeyli yeni əcnəbi, yabançı sözlər daxil olmuşdur. Onların böyük çoxluğu Avropa, daha düzü, Qərb mənşəlidir. Bu sözlər cürbəcür kanallarla gəlmiş və dil adlı canlı bir orqanizmdə özlərinə yer alıb məskunlaşmağa can atırlar. Onlardan hansılarının özlərinə daimi bir hücrə – taxça tapıb-tapa bilməyəcəyini indidən söyləmək çətindir. Ancaq bu sözlərdən çoxu özünü qonaq kimi hiss edib belə aparmaq niyyətində deyillər. Və bir növü "su axar, çuxurunu tapar" prinsipini rəhbər tutmaqdadırlar. Biz onlardan müxtəlif sahələrdə daha çox işlənənlərindən seçmələr edib qısaca nə anlam daşıdıqlarına işıq salmağa çalışacağıq. Bu yazı sözlük, lüğət amallı bir yazı olmadığından əlifba sırası gözləməyə gərək görmədik. Ola bilsin, bu yazı jurnalın bir neçə nömrəsində ardıcıl olaraq çap olunsun (oxucular buna lüzum görsə). Beləcə, gəlin kəlmələrin ən qısa, yığcam anlamlarına nəzər yetirək:

– **Monitor** (ing.) – bəlli parametrlərə (tibbi göstəricilərə, radiasiya səviyyələrinə, atmosfer xarakteristikalarına nəzarət etmək üçün ekranlı qurğu, habelə displey;

– **Monitorinq** (lat.-ing.) – hallarının və inkişaf proqnozlarının qiymətləndirilməsi üçün hansısa prosesləri daim izləmə;

– **Displey** (ing.) – ekrana mətnli və qrafik informasiyanı çıxaran qurğu;

– **Kliringq** (ing., hərfən "təmizləmə") – nağdsız hesablaşma növü;

– **Lizinq** – maşın-mexanizmlərin, avadanlığın istehsalat qurğularının sonradan qalıq dəyərinin tam ödənilməsi şərtilə icarəsi;

– **Prosessor** (lat.-ing.) – kompüterin proqram tərəfindən verilən informasiyanı çevirən və bütün hesablama proseslərini yerinə yetirən mərkəzi hissəsi;

– **Tender** (ing.) – sifarişin müsabiqə əsasında elan edilib yerləşdirilməsi, müzayiqə;

– **Banner** – plastik parça üzərində reklam məqsədli rəngbərəng təsvir və ya şüar;

– **Smart** (ing.) – ağıllı, anlayan, incə;

– **Broker** (ing.) – öz müştərilərinin tapşırığı ilə hərəkət edən firma və ya şəxs, habelə birja vasitəçisi, makler (dəllal);

– **Diler** (ing.) – qiymətli kağızlar və metallar, həmçinin valyuta alveri edən birja üzvü və ya bank, eləcə də topdan aldıqlarını dağınıq, pərakəndə satan sahibkar, iş adamı;

– **Distribüter** (Türkiyədə ona “bayi” deyilir; ing.) – istehsalçı firmanın adından məhsulun satışı və zəmanətli xidməti ilə məşğul olan müəssisə və ya şəxs;

– **Cakuzi** (yap.) – suyu altdan qızdıran və bədəni masaj edən iri ev vannası;

– **Cek pot** (daha düzü, “cək pot”, ing.) – əvvəlki tirajın udulmamış məbləğini də daxil edən ən böyük uduş (lotereyada);

– **Penthauz** (ing.) – binanın yuxarı mərtəbələrində yerləşən və yastı çatıya (dama) çıxışı olan çoxotaqlı mənzil;

– **Mansard** ( ) – çardaqda maili və banlı yaşayış yerləşgəsi;

– **Poster** (ing.) – reklam məqsədləri üçün tərtib olunmuş böyük, bədii məzmunlu plakat (çox vaxt müğənnilər, aktyorlar, musiqiçilər təsvir olunur);

– **Toster** (ing.) – tost (suxarı) hazırlamaq üçün elektrik cihazı;

– **İnteqrasiya** (lat.) – bütünləşmə, birləşmə, hissələrin bir tamda, sistemdə birləşməsi;

– **Moderator** (ing.) – internetdə forum, çat və ya şəbəkə administratoru (müdiri, idarəçisi);

– **Pley-of** (ing.- idman) – son mərhələdə uduzanın çıxması ilə müşayiət olunan oyunlar;

– **Bestseller** (ing.) – böyük tələbatlı, böyük tirajlı ən məşhur kitab, kinofilm və ya teletamaşa;

– **Hit** (ing.) – məşhur estrada mahnısı, mövsümün ən bəyənilənі;

– **Gender** (ing.) – kişi və ya qadın cinsindən olan şəxslərin cəmiyyətdəki rolu ilə bağlı olan;

– **Kreativ** (lat., ing.) – sadəcə yaradıcı;

– **Qlobalizasiya** (ing.) – nəyəsə qlobal, ümumdünya miqyası verilməsi (qlobus – yer kürəsi sözündən);

– **Modul** (lat.) – dəqiq elmlərdə bəzi əmsalların, ölçü və kəmiyyətlərin adı, habelə hansısa bir sistemin, təşkilatın nisbi ayrıcalaşa bilən hissəsi;

– **Barrel** (ing., hərfən “çəllək”) – 159 litrə bərabər ölçü vahidi;

– **Bonus** (lat., qazanc, mükafat) – əqdlərdə böyük partiyalarla və bayramlarla bağlı qiymət endirimi, güzəşti;

– **Tonus** (ing.) – orqanizmin və ya ayrı-ayrı toxumaların yaşarılıq dərəcəsi;

– **Brauzer** (ing.) – kompüter ekranında kompüter şəbəkələrindən olan informasiyanın axtarışı və baxışı üçün proqram;

– **Server** (ing.) – informasiyanın avtomatik işlənməsi sistemlərində xidmətçi qurğu;

– **Marketinq** (ing.) – istehsal və satışın bazarın mal və xidmətlərə tələbatının öyrənilməsinə əsaslanan təşkili;

– **Brifinq** (ing.) – məlumat xarakterli qısa mətbuat konfransı;

– **Sörfinq** (su idmanı növü) – xüsusi lövhədə okean dalğaları üzərində züymə (sürüşmə);

– **Diaspora** (yun., hərfən "səpələnmə") – öz yurdundan kənarda yaşayan, milli-mədəni cəhətdən təşkilatlanmış milli və ya dini azlıq (qrup);

– **Ajiotaj** (fr.) – nəyəsə diqqət cəlb etmək üçün süni yaradılmış həyəcan, hay-küy, vəlvələ (ingilis "bum" sözü də elə bu mənadadır);

– **Rouminq** (ing.) – öz operatorunun xidmət dairəsindən kənarda mobil telefondan istifadə imkanı;

– **Laminasiya** (lat.) – sənədin, kartın, açıqcanın və s. üzərinə şəffaf qoruyucu çəkilməsi;

– **Sloqan** (ing.) – şüar və ya deviz;

– **Kempinq** (daha düzü, kəmpinq, ing.) – avtoturistlər üçün yay düşərgəsi;

– **Kottec** (ing.) – şəhər civarında və ya işçi qəsəbəsində abad fərdi yaşayış evi;

– **Mentalitet** (fr.) – xalqın, ictimai qrupun, şəxsiyyətin düşünüş tərzi, ağlının, zehniyyətinin, dünyanı qavrayışının özücürlüyü (özünəməxsusluğu);

– **İnteryer** (fr.) – binanın içərisi, eksteryer – binanın dış görkəmi, bayırı;

– **Çarter** (ing.) – su və ya hava gəmisinin bəlli bir müddətə və ya reys üçün icarəsi, habelə reysin özü;

– **Barter** (ing.) – mal mübadiləsi, natural dəyişmə;

– **Şeyker** (ing.) – silkələmə yolu ilə kokteyl hazırlamaq üçün xüsusi qapalı qab;

– **Şou** (ing.) – estrada tamaşası və əyləncəli proqram;

– **Holl** (ing.) – ictimai binalarda (məsələn, otellərdə, teatrlarda) istirahət və gözləmə üçün olan böyük yerləşgə;

– **Hamburger** (Hamburq şəhərinin adından, "qamburqer" yox, alm.) – içərisinə kotlet, pendir, qaxac və s. qoyulan bulka;

– **Broyler** (ing.) – ətlik ikiaylıq cücə;

– **Patologiya** (yun.) – orqanizmdə xəstəlik prosesləri, normadan kənarlaşmalar haqda elm;

– **Kruiz** (ing.) – bəlli bir marşrut üzrə dəniz səyahəti;

– **Vertebroloq** (yun.) – onurğa xəstəlikləri mütəxəssisi;

– **Prekursor** (ing.) narkotik vasitə və psixotrop maddələrin hazırlanma və emalında istifadə olunan maddələr;

– **Blender** (ing.) – qidanın narın doğranması, içkilərin köpürdülməsi, buzun xırdalanması üçün cihaz.

**KİMLƏR KEÇDİ BU DÜNYADAN**



## LAÇIN DAĞLARININ NƏCİB ŞAİRİ

Bu yazıda mənalı ömrünün 50 ilini mətbuata həsr etmiş bir şəxs – füsunkar gözəlliyi ilə insanı valeh edən, hər daşının altından buz bulaqlar qaynayan Laçın rayonunun Əhmədli kəndində dünyaya göz açmış Tapdıq Nəcəfov (Tapdıq Nəcib) haqqında söz açmaq istədim.

Ucqar dağ kəndlərində yaşayan sakinlərin həyat tərzi çox çətin keçsə də, Molla Əhmədli kəndində adamların bir-birlərinə qarşı olan hörməti, məhəbbəti daha da güclü idi. Gənc yaşlarında Yusif atanın Xatun anaya qarşı olan istəyi, məhəbbəti örnək sayıla bilərdi. Ailədə qızlar dünyaya göz açanda kişini qınayanlar da tapılırdı...

"Ay kişi, qız övladı səni "basıbdır". Arvadın Xatuna denən ki, bağlasın bu qız "zavodunun" ağzını, ta bəsdi, bir oğlan uşağı olsa Allah-taalaya da xoş gedər, – deyirdilər.

Yusif kişi isə: "Verən də, alan da Allah-taaladır, özü bilən məsləhətdir", – deyə təmkinini pozmazdı.

...Xatun ana "ağır yükünü" yerə qoyanda, uşaq anadan olanda Yusif kişini muştuluqladılar ki, gözlərin aydın olsun, ay Yusif kişi, dörd qızdan sonra bir oğlun olub...

Yusif kişi ağır əkin-biçin işləri ilə məşğul olurdu, xəbəri eşidən kimi, əlini işdən saxladı, alnının tərini sildi və islanmış əllərini yerə tərəf çırpdı. Şumladığı torpağa tərəf əyildi və qoşalaşmış əlləri ilə torpaqdan bir ovuc götürdü, torpaq isə barmaqlarının arasından süzülərək yerə, öz yerinə tərəf töküldü. "Oğlan düşmən çəpəridir, axır ki, dörd qızdan sonra bir oğlan tapdım", – deyə pıçıldadı.

Ailədə təzə anadan olan oğlan uşağının adını Tapdıq qoydular. Az keçmədi ki, ailədə bədbəxtlik üz verdi, Xatun ana dünyasını dəyişdi. Yusif kişinin əzablı-əziyyətli günləri başladı. Ata anaları ölən övladların böyüməsində çox əzab-əziyyətlər çəkməli oldu.

Ailənin ağır güzaran və ehtiyac içində olması Yusif kişiyə bərk təsir edir, buna dözə bilməyən ailənin başçısı da qəflətən dünyasını dəyişir. Dörd qız, bir oğlan yetim qalır. Yaxın qohumlarının, xeyirxah adamların himayəsi nəticəsində uşaqlar böyüyüb ərsəyə çatırlar...

Bəli, Tapdıq Nəcib (Tapdıq Yusif oğlu Nəcəfov) 1913-cü ildə dünyaya yoxsul kəndli daxmasında göz açdısa da, həyatı işıqlı oldu, ömrü şam kimi başqalarına işıq verdi.

Balaca Tapdıq Əhmədli kəndində ilk ibtidai sinfə gedərək yazmağı, oxumağı öyrəndi. 1925-1928-ci illərdə komsomolun sıralarında mətinləşən Tapdıq Nəcəfov əmək fəaliyyətinə Qılışlı və Əhmədli kəndlərində savadsızlığı ləğv edən kurslarda müəllimliklə başladı.

O, 1933-cü ildə Ağdam şəhərində fəhlə fakültəsini, 1946-cı ildə isə Laçın Pedaqoji məktəbini bitirdi, 1949-cu ildə isə Bakıda bir illik partiya məktəbinin dinləyicisi oldu.

Gənc yaşlarından ədəbiyyata və mətbuata böyük həvəs göstərən Tapdıq Nəcəfov 1933-cü ildə Ağcabədidə çıxan "Pambıqçı" qəzeti mətbəəsində çapçı köməkçisi kimi fəaliyyətini davam etdirdi. Onun istedadını və işgüzarlığını nəzərə alaraq qəzetin məsul katibi vəzifəsinə irəli çəkdilər.

1937-ci ildə boya-başa çatdığı Laçına gəldi və burada nəşr olunan "Laçın" rayon qəzetində məsul katib vəzifəsində çalışdı.

Rayonumuzun elə bir yaşlı sakini olmaz ki, Tapdıq Nəcəfovu tanımasın, onun qəzetlərin səhifələrində yazılarına, şeirlərinə rast gəlməsin, mənalı, maraqlı şeir dünyasına baş vurmasın. Doğrudan da onun həyatı, yaradıcılığı həyati hadisələrlə, maraqlı epizodlarla zəngin idi.

Tapdıq Nəcib gənc yaşlarında həmişə elatla dağa-arana gedib-gələn ailədən bir qız sevib-seçir. Gözəl, amma ərköyün olan həmin qızla evlənir. Qızın ata-anası hər il olduğu kimi yenə də arandan yaylağa köç edirlər. Köç isə Nəcibin yaşadığı Əhmədli kəndindən gedib-gələrmiş...

Bir dəfə necə olursa, evdə heç bir giley-güzar olmadan, gəlin icazəsiz olaraq ər evindən ata-anasına qoşulub yaylağa gedir. Çox gözləyir ki, bəlkə onun arxasınca gələn ola. Ancaq Nəcib inadkarlığından dönmür ki, dönmür...

Payızda arana qayıdan köç kənddən keçən zaman gəlin köçdən aralanıb ər evinin həyətinə girir. Nəcib onu qapının astanasında görür və hiss edir ki, gəlin utandığından içəri girmir, qayıdır ki:

***...Heç bilmədin al-yaşılın qədrini,***
***İndi həsrət qalıb bizə gəlirsən.***

Həmin sözdən sonra gəlin arxaya dönür, ata-anasından ayrılmayıb birdəfəlik arana gedir.

Lülpər, İşıqlı dağlarını, Çınqıllı, Abadxeyir dərəsini, Qırxbulaq, İstisu, Çalbayır yaylaqlarını çox sevərdi, ilham alardı. Bu duyğudan misralar çözələnərdi:

***Lülpər nə gözəldir! Basəfa dağdır,***
***Başının çalması daima ağdır.***
***Amandır deməyin Nəcib qonaqdır,***
***Deyin ki, bu yerli, buralı gördüm.***

"Laçın" rayon qəzetində ayda bir dəfə "İşıqlı üfüqləri" ədəbi yaradıcılıq məclisinə toplanan gənc şairlər, şeir həvəskarları təzə yazdıqları şeirlərini oxuyardılar. Hər il Əhmədli kəndində dincəlməyə gələn həmyerlimiz Hüseyn Kürdoğlu da məclisə qatılar, neçə-neçə yeni şeirlər yaranardı. 1975-ci ilin söhbəti idi. Nəcib İşıqlı dağının əzəməti haqqında "Dağların" şeirini oxumuş, Hüseyn müəllim də ona eyni rədifli cavab şeiri yazmışdı:

***Burda pərvazlanıb qanad çalmışam,***
***Xilqətin hüsnünə heyran qalmışam.***
***Ələsgər sazından bir tel almışam,***
***İndi də şairi mənəm dağların.***

Tapdıq Nəcib jurnalist əməyinin nə qədər çətin, əzablı olmasını yaxşı bilirdi. Mətbuat işçisi həmişə başqa adamların da yerinə narahat olur, bəzən tanımadığı, hətta ömrü boyu üzünü belə görmədiyi adamların fikri onu günlərlə, aylarla məşğul edir.

"Laçın" rayon qəzetinin işıq üzü görməsində uzun illər zəhməti olan əsl mətbuat fədaisi Tapdıq Nəcib heç vaxt yorulmaq, usanmaq bilməzdi. Özünü bütünlüklə yazıb-yaratmağa, qəzetə həsr etmiş bu şəxsin zəngin arxivini gözdən keçirəndə heyrətlənməyə bilmirsən.

Ömrünün uzun illərini qəzet işinə həsr edərək ədəbi işçi, məsul katib, redaktor kimi fəaliyyət göstərən Tapdıq Nəcib dostluqda da çox sədaqətli, həssas idi. Şair Səyyah Məhəmmədin səhhətində problemlər yarananda onu heç vaxt tək qoymaz, daim qayğısına qalardı.

Tapdıq Nəcib vaxtı ilə Laçın rayonuun kəndlərində yazıb-yaratmış Qara Kərim, Aşıq Alı, şair Məmmədalı kimi el sənətkarlarının şeirlərini də toplayıb qəzetin səhifələrində çap etdirərdi.

...Yaxşı yadımdadır, 1973-cü ildə "Laçın" qəzetində ilk məqaləm çap olunmuşdu. Onda IX sinifdə oxuyurdum, çox sevinirdim. Yaşadığım kənddən səhər tezdən avtobus rayon mərkəzinə gələr, nahardan sonra isə kəndə qayıdardı. Avtobusdan düşüb redaksiyaya getdim, ilk dəfə Tapdıq Nəcəfovla tanış oldum. Söhbətimiz uzun çəkdi, onun məsləhətlərinə qulaq asdıqca, vaxtın necə gəlib, necə keçdiyini unutmuşdum. Kəndə qayıdan avto-

busa gecikdiyimi bilib məni öz evlərinə apardı. Telefonla valideynlərimə xəbər verdi ki, narahat olmasınlar.

Tapdıq Nəcəfovun ailəsində yeddi övlad: 3 oğlan, 4 qız tərbiyə alıb. Yusif, Qalib, Yaşar, Qəndaf, İnnab, Gülcamal və Badam.

Yaşar Sverdlovski şəhərində Tümen Sənaye İnstitutunu bitirib Laçın rayon avtobazasında çalışırdı. 1992-ci ildə Dağlıq Qarabağ hadisələri başlayanda könüllü olaraq orduya birinci yazılanlardan oldu. Böyük döyüş yolu keçən Yaşar 2002-ci ildə orududan tərxis olunub, hal-hazırda fərdi əməklə məşğuldur.

Nəcib babanın 23 nəvəsi, 38 nəticəsi var.

Maraqlı felyetonları ilə şöhrət qazanmış müxbir Mirzə Əhməd, “Kommunist” qəzetinin felyetonçusu Əsəd Əyyubi, Qulam Məmmədli, A. Kazımov və digər güclü qələm sahibləri ilə tanışlığı imkan yaradır ki, Tapdıq Nəcəfov respublika mətbuatında çıxış etsin.

1977-ci ildə təqaüdə çıxmasına baxmayaraq ömrünün axırınadək Laçın Rayon Mədəniyyət Şöbəsində tarixi abidələrin mühafizəçisi işləmiş və uzun illər əməkdaşlıq etdiyi “Laçın” qəzetində, “Kirpi” jurnalında, respublika radiosunda və başqa mərkəzi mətbuat orqanlarında günün aktual məsələlərinə həsr edilmiş tənqidi materiallarla çıxış etmişdir.

Şair, publisist, jurnalist Tapdıq Nəcibin yolunu nəvəsi Əfsanə davam etdirir. O, Azərbaycan Müəllimlər İnstitutunu bitirib. Bakı Slavyan Universitetinin yaradıcılıq fakültəsində təhsil alıb. Uşaq şeirləri, hekayələri və nağılları yazır. “Tumurcuq”, “Günəş”, “Göyərçin” qəzetlərində çıxışlar edir. “Bir damcı ürək” adlı şeirlər kitabı işıq üzü görüb. 2013-cü ildən Azərbaycan Yazıçılar Birliyinin üzvüdür, 2014-cü ildə Prezident təqaüdünə layiq görülüb.

Qocaman jurnalist, yerli əhəmiyyətli fərdi təqaüdçü Tapdıq Yusif oğlu Nəcəfov 1982-ci ildə 69 yaşında vəfat etmişdir.

Hüseyn Kürdoğlu hər il doğma elinə, Əhmədliyə istirahətə gələndə onlar bir-birlərinə baş çəkər, görüşərdilər.

Tapdıq Nəcibin qəfləti ölüm xəbəri Hüseyn Kürdoğlunu sarsıtmışdı:

***Laçın dağlarının Nəcib şairi***
***Qartal oylağından ayrıldı getdi.***
***O da məcnunuydu şeirin, sənətin,***
***Məcnun bulağından ayrıldı getdi.***

Tapdıq Nəcibin ölüm xəbərini Qoşasu kənd sakini, “İşıqlı üfüqləri” ədəbi birliyinin fəal üzvü, şair Pənah Mikayılov da böyük kədərlə qarşılamışdı:

*Qəlbimə qəm çöküb, susubdu neyim,*
*Amansız əcəldən çoxdu gileyim.*
*Dilim var gəlməyir, ölübmü deyim*
*Məndən əhvalımı "sorana", Nəcib?!*



Şeirləri, yazıları dövri mətbuatımızda sevilə-sevilə oxunan, ömrünün əlli ilini bu şərəfli işə həsr edən Tapdıq Nəcibin yaradıcılıq nümunələrinin kitab şəklində çap olunması vaxtı çoxdan gəlib çatmışdır. Oxucuların, qohumların bu xeyirxah işə yardımçı olmaları gərəkdir. Şeirlərinin toplanmasında fəal iştirak etmələrini xeyirxahlıq kimi qəbul edərdik.

**Nemət BƏXTİYAR,**
***Azərbaycan Jurnalistlər Birliyinin üzvü,***
***"Qızıl qələm" mükafatı laureatı***

**QAZİLƏRİMİZ**



## TORPAQLARIMIZ HƏLƏ DƏ DÜŞMƏN İŞĞALINDADIRSA...

Bəzi insanlar özləri haqqında danışmağı, keçmiş xidmətlərini yada salmağı sevməzlər və üstünlüyü susmağa verərlər. Belə insanlardan biri də Ramiz Cəlil oğlu Salahovdur. Onu çoxdan tanısam da, barəsində demək olar ki, çox az məlumatım vardı. Söhbətimizin səmti həmişə başqa istiqamətə yönələr, daha çox bu günün reallıqlarından söhbət açardıq. Təsadüfən "Xocalının səsi" qəzetində "Altı il döyüş səngərində" məqaləsinə rast gəlməsəydim, heç onun Qarabağ qazisi olmağından da xəbər tutmayacaqdım.

...Ramiz Salahov əslən Laçın rayonunun Arduşlu kəndindəndir. Babası Söydümalı kişi ömrünün ahıl çağlarında ailəsi ilə birlikdə Xankəndinin yaxınlığında yerləşən Kərkicahan kəndinə köçüb. Ramizin də taleyinə 1963-cü ildə bu kənddə doğulmaq, xain ermənilərlə qonşuluqda yaşamaq düşüb. Burada orta təhsil alıb, Xankəndindəki ipək kombinatında fəhlə işləyib. Atası Cəlil kişinin də çalışdığı bu kombinatda Ermənistanın sabiq prezidenti Koçaryan komsomol komitəsi katibinin müavini olub. Cəlil kişi ilə Koçar-

yan arasında dəfələrlə münaqişələr düşsə də, hadisələrin bu həddə çatacağı ağıllarına da gəlməzdi: "Hətta azərbaycanlıların pasportlarını başqa məqsədlə yığıb onların adından Moskvaya teleqramlar vururdular ki, guya biz Ermənistana birləşmək istəyirik. Çox təəssüf ki, bunu da çox sonralar anladıq".

Ramiz və Kamal uşaqlıq dostları idilər. Hər ikisi Kərkicahanda doğulub ərsəyə çatmış, 8-ci sinfi də öz doğma kəndlərində başa vurmuşdular. Xankəndindəki orta məktəbi bitirən bu gənclər şəhərdə ipəkçilik kombinatında təzəcə fəhləliyə başlamışdılar ki, necə deyərlər, ara qarışıb, məzhəb itdi. Onlar kombinatda ermənilərlə tez-tez əlbəyaxa olurdular.

İpəkçilik kombinatının direktoru bəhanə edərək hər iki gənci işdən qovdu. Ermənilər azərbaycanlıları Kərkicahanda dinc oturmağa qoymurdular. Erməni millətçiləri öz qonşularına xain gözlə baxmağa başladılar. 1988-ci ildə Kərkicahanda yaşayan azərbaycanlılarla Xankəndindəki ermənilər arasında gərgin düşmənçilik başladı. Ermənilər azərbaycanlılara dinclik vermir, ələ keçəndə onları döyür, Xankəndinə getməyə qoymurdular. Kərkicahan camaatı Şuşa ilə əlaqəni Qaybalı kəndi vasitəsilə saxlamağa məcbur olurdu.

Ramiz öz dostu Kamal Mirzəyev, habelə həmyerliləri Saleh Şükürov, Novruz Rəsulov, Əfqan Salahov, Zülfüqar İbrahimov və başqaları ilə könüllü dəstə düzəltməyi, ermənilərə qarşı mübarizə aparmağı qərara aldı. Azərbaycanın Daxili İşlər naziri, general Məhəmməd Əsədovun təşəbbüsü ilə yaradılan Xüsusi Təyinatlı Polis Batolyonunun Mərdəkan qəsəbəsində təşkil olunmuş bir illik kursunu bitirdikdən sonra doğma yurdlarının keşiyini çəkmək üçün Kərkicahana yola düşdü. Kəndi 20 nəfər gənc polis müdafiə edirdi.



Noyabr günlərindən biri idi. Kamal kəndin aşağı hissəsindəki postda keşik çəkirdi. Gecədən xeyli keçmiş Xankəndindən körpüyə bir neçə erməninin gəldiyini gördü. Qarşıdakı yekəpər ermənini tanıdılar. O, kərkicahanlılara qan uddururdu. Ramiz avtomatı alınca ona tuşladı. Güllənin açılmağıyla dığanın bağırıb körpüdən aşağı uçmağı bir oldu. Bunu gözləməyən "erməni boyevikləri" qaçmağa üz qoydular. Bir azdan yeni qüvvələr körpüyə tərəf gəlməyə başladılar. 1991-ci ilin dekabrında Xankəndindəki xain qonşular kütləvi şəkildə Kərkicahana hücuma keçdilər. Ramizgil səngərə girib bir müddət vuruşdular. Ancaq sayca çox olan düşmənlər həm də tex-

nikanın müşayiəti ilə irəliləyirdilər. Kəndin dinc əhalisinin kənddən çıxması üçün polis işçiləri səngərdən çıxmırdı. Hətta yaralılar da düşmənlə vuruşurdular. Ramizlə Kamalın atdığı güllələr boşa getmirdi. Ermənilər bunu görüb bir müddət atəşi kəsdilər. Gənc polislər bundan istifadə edərək bir neçə nəfərin yaralarını sarıdılar. Axırda döyüşçülər Kərkicahanı tərk edərək Şuşaya tərəf üz tutdular. Elə bu anda Şuşanın taleyi də qara geymişdi. Bu tarixi şəhər ermənilər tərəfindən işğal olunmuşdu. Ramiz Salahov və onun döyüş yoldaşları vuruşa-vuruşa Turşsuya, oradan da Laçına üz tutdular.

Bir müddətdən sonra Ramizlə Kamalın səsi-sədası yenə səngərlərdən gəlirdi. Ağdərə bölgəsinə yola düşdülər. 6 il səngərlərdə vuruşan Ramiz Salahov və dostları Vətəni düşməndən azad etməyənə kimi silahı yerə qoymayacaqlarına and içdilər. Son zamanlar Kamala da, Ramizə də isə gizir rütbəsi verilmişdi. Ancaq zalım fələk onları bir-birindən tez ayırdı. Soyuq bir qış günündə postu dostu Kamala təhvil verib dincəlməyə gedən Ramiz yolda qəflətən düşmən topunun atəş səsini eşitdi. Onun ürəyinə nəsə damdı. Yenidən geriyə posta tərəf qaçdı. Səngərə çatanda dəhşət onu bürüdü. Düşmənin atdığı topun mərmisi düz Kamalın qucağına düşüb partlamışdı.



Kamal Mirzəyevi Bakıdakı Şəhidlər xiyabanında dəfn elədilər. Ramiz vəfalı dostunun məzarı önündə düşməndən onun qisasını alacağına and içdi. O, andına sadiq qalaraq dəfələrlə düşmənin canlı qüvvəsini və texnikasını məhv etdi.

Ramiz Salahov polis batolyonunun Kərkicahan bölməsində xidmətə başlamasını, bir neçə dəfə erməniləri kənddən çıxarıb Xankəndinə qovduqlarını, Şuşa polis batolyonunun tərkibində döyüşərək Ağdərəni aldıqlarını və Çıldırana kimi gedib çıxdıqlarını xatırlayır. Döyüş dostları Kamal, "kobra" ləqəbli Nazim, Fərman Xəlilovun adlarını tez-tez çəkir. Eyni zamanda təəssüfünü də gizlədə bilmir və baxışları sanki "Torpaqlarımız hələ də düşmən işğalındadırsa, nədən danışaq?" – deyir.

İki övlad atası, keçmiş döyüşçü ümidsiz də deyil. Torpaqlarımızın tezliklə düşmən tapdağından azad ediləcəyinə inanır və təcrübəli döyüşçü kimi qələbə savaşına hazırdır. Ali Baş Komandanın əmrini gözləyir.

**Arif MƏMMƏDLİ**

**KİMLƏR KEÇDİ BU DÜNYADAN**

## FƏDAKAR ALİM ÖMRÜ

*"Gəlimli-gedimli dünya,*
*Son ucu ölümlü dünya!"*

Sirli-sehrli bu dünyadan kimlər gəldi, kimlər keçdi... "Bu dünya bir pəncərədir" deyənlər, yəqin ki, öz fikirlərində yanılmayıblar. O pəncərədən baxıb gedənlərin içərisində öz həyatını şərəflə – ədalətli, halal, təmənnasız, bir sözlə, layiqli yaşayan insanlar çox oldu. O insanlar ki, sənəti və əməyi ilə xalqına, dövlətinə, Vətəninə vicdanla xidmət edib layiq olduqları əbədi dünyanın əbədi sakinlərinə çevrildilər. Onlar aramızda cismən olmasalar da, zamanında öz nümunəvi əməlləri, gördüyü işləri, hətta davranışları ilə cəmiyyətin güzgüsü oldular və bu gün də olmaqdadırlar. Bəzən ağlımıza belə bir fikir gəlir: "Bu gün biz varıq, artıq onlar yoxdur". Belə düşündükdə çox böyük səhvə yol vermiş oluruq. Amma bir şeyi unutmamalıyıq ki, o insanlar dünyalarını dəyişsələr belə, cəmiyyət üçün etdikləri, belə demək mümkünsə, miras qoyduqları hələ uzun illər bizlərə gərəkli olacaq. Elə bu ovqatla da mən müsbət insani keyfiyyətləri özündə ehtiva edən, xalqını, Vətənini sevən şəxsləri nəzərimdə tutaraq bu yazını fikir dünyamın təfəkkür süzgəcindən keçirərək qələmə alıram.

Təqdim edəcəyim, haqqında danışacağım insan bu gün bizlərlə olsaydı, 85 yaşı tamam olacaqdı. Öncə istərdim, bu şəxsin tərcümeyi-halına dəyərli oxucularla birgə səyahət edəm.



Mirzəyeva Mənsurə Rza qızı 1931-ci il aprelin 8-də Odlar yurdu, günəşli Azərbaycanın paytaxtı, mavi Xəzərin sahilində yerləşən Bakı şəhərinin ən qədim və ən böyük kəndlərindən olan, ziyalıları ilə sayılıb-seçilən Buzovna kəndində dünyaya göz açmışdır. Sadə və kasıb ailədə doğulan, üç bacı, üç qardaşı olan bu qızcığazın taleyində enişli-yoxuşlu yolların olacağı Tanrıdan başqa heç kimə bəlli deyildi. İlk təhsilini doğma Buzovna qəsəbəsində yerləşən, əsası 1939-cu ildə qoyulan 125 nömrəli orta məktəbdə almağa başlamış və həmin məktəbin ilk məzunlarından biri kimi bu tədris ocağını 1949-cu ildə müvəffəqiyyətlə bitirmişdir. Məktəbdə oxuduğu ilk illər ağır bir zamana – Böyük Vətən müharibəsinə təsadüf etsə də, tədris dövründə verilən dərs tapşırıqlarını həmişə həvəslə yerinə yetirmiş və öz uğurları ilə müəllimlərini sevindirmişdir. Yay tətili zamanı asudə vaxt

imkanını düzgün dəyərləndirərək yeni dərs ilinin proqramına daxil edilmiş materialları öncədən mənimsəmək onun təhsilə olan istəyindən xəbər verirdi. Odövrkü çətinliklərə baxmayaraq, oxumaq və təhsil almaq, ali məktəbə daxil olmaq onun həvəs, maraq dünyasında birinci yerdə qərarlaşmışdı. Elə bu istəklə də məktəbi bitirən ili, 1949-cu ildə uğurla imtahan verərək Azərbaycanda ilk ali təhsil ocağı olan Azərbaycan Dövlət Universitetinə (indiki Bakı Dövlət Universiteti) qəbul olunur. 1954-cü ildə daxil olduğu kimya fakültəsini fərqlənmə diplomu ilə bitirərək neft kimyaçısı ixtisasına yiyələnir. Gənc məzun təyinatla Azərbaycan Dövlət Universitetinin kimya fakültəsinin analitik kimya kafedrasına göndərilsə də, öz arzusu və xahişi ilə neft kimyasından ona mühazirə oxumuş, diplom işinin rəhbəri olan dünya şöhrətli alim, akademik Zelinskinin tələbəsi Yusif Heydər oğlu Məmmədəliyevin Azərbaycan Elmlər Akademiyasının Neft İnstitutunda rəhbərlik etdiyi elmi-tədqiqat laboratoriyasında əmək fəaliyyətinə başlamağa üstünlük verdiyi üçün sevimli müəlliminin (Y.Məmmədəliyev 1954-cü ildə ADU-nun rektoru, həm də Azərbaycan Elmlər Akademiyasının prezidenti vəzifələrini icra edirdi) qəbulunda olmuş, həmin ildən onun rəhbəri olduğu kataliz laboratoriyasında baş laborant, sonra isə kiçik elmi işçi vəzifələrində işləmişdir.



**Dekabr, 1955**

Gənc kimyaçının sonrakı elmi fəaliyyəti aspiranturaya qəbul olunmaqla davam etmişdir. Müdafiə etdiyi namizədlik dissertasiyasının mövzusu böyük alim, akademik Y.Məmmədəliyev tərəfindən verilsə də, mövzu alimin ölümündən sonra 1967-ci ildə kimya elmləri doktoru, professor, Azərbaycan Elmlər Akademiyasının müxbir üzvü Mustafa Hüseynovun rəhbərliyi ilə uğurla müdafiə olunmuş və Mənsurə xanım kimya elmləri namizədi alimlik dərəcəsi almışdır. Kimyaçı-alimin elmi fəaliyyəti 1954-cü ildən yuxarıda adı çəkilən laboratoriyada başlasa da, sonrakı fəaliyyəti Azərbaycan Dövlət Universiteti ilə bağlı olmuşdur. 1970-ci ildən bu ali təhsil ocağında alim və pedaqoq kimi çalışmışdır. Belə ki, Azərbaycanda neft kimyasının banisi, dünya şöhrətli alim Y.Məmmədəliyevdən aldığı, öyrəndiyi elmi biliklərini vurğunu olduğu şərəfli və məsuliyyətli müəllimlik peşəsinin qüdrəti ilə kimya fakültəsində, özünün ixtisaslaşdığı neft kimyası kafedrasında assistent, baş müəllim, 1982-ci ildən isə neft kimyası və kimya texnologiyası kafedrasında dosent kimi çalışaraq tələbələrə, bu sahənin gələcək mütəxəssislərinə öyrətməkdən heç zaman yorulmamışdır. Alimin neft kimyası və neft kimyəvi sintezdən bakalavrlara, digər mövzularda isə magistrlərə mühazirə oxuması, eyni vaxtda həmin fənlərdən laboratoriya məşğələləri və seminarlar aparması, çoxsaylı diplom işlərinə rəhbərlik etməsi, 70 elmi məqalənin, 5 müəlliflik şəhadətnaməsinin, neftdən oxunan mühazirə və laboratoriya işlərinə aid 2 kitabın, bir neçə metodik vəsaitin müəllifi olması bu yorulmaz fəaliyyətin bariz təzahürüdür. Məhz bu səbəbdən Mənsurə xanım səmərəli elmi-pedaqoji fəaliyyətinə görə 2001-ci ildə Azərbaycan Respublikası Təhsil Nazirliyinin Fəxri fərmanı ilə mükafatlandırılmışdır. 2009-cu ildə isə Bakı Dövlət Universitetinin 90 illik yubileyi ərəfəsində Azərbaycan Respublikası Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət Komitəsinin Fəxri fərmanına layiq görülmüşdür.



***Bakı Dövlət Universiteti, 2001-ci il***

Mənsurə xanım həmkarları, tələbələri və onu əhatə edən ətrafı tərəfindən həmişə böyük hörmət və rəğbət görmüşdür. Lakin bu fədakar elm və maarif xadiminin əməyinin bir daha rəsmi şəkildə qiymətləndirilməsi – onun respublikanın Əməkdar müəllimi kimi fəxri ada layiq görülməsi bu münasibəti bir daha təsdiq etmiş olardı. Təəssüf ki, bir sıra hallarda olduğu kimi laqeydlik, diqqətdən kənarda qalma vəziyyəti burada da özünü göstərmişdir. Ancaq deməliyəm ki, yalnız təəssüf hissinə gətirib çıxaran bu

hal Mənsurə xanımın qazandığı hörmətə, ad-sana və şərəfə heç bir xələl gətirməmişdir. Əksinə, onu tanıyanlar, sevənlər, bu gün böyük hörmətlə xatırlayanlar çox gözəl bilirlər ki, öz zərif çiyinlərində həyatın ən ağır yükünü daşımağa qadir olan bu xanım əsl zəhmət adamı, əsl əməkdar təhsil fədaisi olmuşdur.

Mənsurə xanımı yaxından tanıyan birisi kimi onun şəxsiyyətini bu cür xarakterizə edərdim: mənəviyyatlı, vicdanlı, ədalətli, səmimi, təvazökar, zəhmətkeş, xeyirxah, qürurlu, təəssübkeş və məsuliyyətli. Bütün bunları özünü dərk etdiyi andan ta ömrünün sonuna kimi şərəflə daşımış və hər bir kəsdə bu keyfiyyətlərin olmasını arzulamış, eyni zamanda həm də aşılamışdır. Ona görə yox ki, bu keyfiyyətlər onun özündə vardı. Ona görə ki, bu keyfiyyətlər insanı insanlıq zirvəsinə qaldırır, insanı daha dəyərli, cəmiyyətdə sayılıb-seçilən edir, nümunəvi şəxsə çevirir.

Məhz bu xüsusiyyətlərinin sayəsində fədakar bir ana kimi də Mənsurə xanım bütün çətinliklərə güc gələrək iki qız övladını böyütmüş, onlara ali təhsil vermiş (böyük övladı Mehdiyeva İradə Nadir qızı Bilgəh Kardioloji Sanatoriyasının həkim-kardioloqu, kiçik övladı isə Mirzəyeva Təranə Nadir qızı Azərbaycan Tibb Universitetinin patoloji anatomiya kafedrasının baş müəllimi, tibb üzrə fəlsəfə doktorudur) və onların cəmiyyətdə gərəkli vətəndaş kimi yetişməsində valideyn olaraq öz köməyini əsirgəməmişdir. Həmçinin qismətinə iki nəvə (hər iki nəvəsi Azərbaycan Tibb Universitetinin məzunudur) və bir nəticə payı düşən bu insanı xoşbəxt nənə də hesab etmək düzgün olardı. Çünki hər bir nənənin ən böyük arzusu olan nəvə toyu görmək ona da nəsib olmuş, hər iki nəvəsinin toyunda məclisin ağbirçəyi kimi iştirak etmişdir.



***12.04.2009***

İstedadlı alim, bacarıqlı müəllim və ən əsası isə gözəl insan olan Mənsurə xanım haqqında daha çox, daha ətraflı yazmaq olar. Amma mən fikirlərimi burada tamamlamaq və son olaraq qeyd etmək istəyirəm ki, mübaliğədən uzaq, həqiqət və reallıqları üstün tutaraq bu insanı nə ilahiləşdirmək niyyətini güddüm, nə də onun şəxsiyyətinə pərəstiş etmək fikrim oldu. Məqsədim yalnız və yalnız bu insan haqqında eşitdiklərimi, ən vacibi isə gördüklərimi Tanrının izni ilə qələmə alıb dəyərli oxuculara təqdim etmək şərəfinə nail olmaq idi. Güman edirəm ki, alındı.

**Elnur MEHDİYEV**

**ŞƏHİDLƏRİMİZ**

## LAÇINDAN BAŞLANAN DÖYÜŞ YOLU...

XX əsrin sonlarında erməni daşnaklarının torpaqlarımıza təcavüzü başlayanda digər bölgələrimiz kimi, Biləsuvar rayonunun qəhrəman oğulları da silaha sarılaraq, Vətənimizin müdafiəsinə yollandılar. Biləsuvarın 122 nəfər igid oğlu bu amal uğrunda gedən döyüşlər zamanı şəhidlik zirvəsinə yüksəlib. 114 nəfər biləsuvarlı isə Qarabağ müharibəsi əlili statusu alıb. Daxili Qoşunların sıralarında müddətli həqiqi hərbi xidmət keçmiş cəsur döyüşçü Mübariz İbrahimov isə ölümündən sonra Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülüb. Biləsuvarın şəhidlik zirvəsinə ucalan cəsur oğullarından 13 nəfəri məhz Daxili Qoşunların hərbi qulluqçuları idi.

Belə qəhrəmanlardan biri – Daxili Qoşunların sıravi hərbi qulluqçusu şəhid Saleh Hüseynovun həyat və döyüş yolu barədə məlumat verəcəyik.



Sıravi Saleh İsi oğlu Hüseynov 1973-cü il dekabr ayının 31-də Biləsuvar rayonunun Fioletovka kəndində (indiki Çaylı – A.Ə.) dünyaya göz açıb. Hüseynovlar ailəsində doğulub boya-başa çatan on üç övladdan biri idi Saleh. İsi kişinin və Dönə ananın min bir zəhmətlə böyüdüb tərbiyə etdiyi övladlarının (Böyükxan, Əlixan, Mübariz, Təzəgül, Əsməgül, Hafiz, Ramiz, Xanımqız, Qabil, Valeh, Şahxanım, Saleh və Gülbəniz) ən sevimlisi idi. Saleh orta təhsilini Əlimərdan Hüseynov adına doğma Çaylı kənd orta məktəbində almışdı. Bu təhsil ocağını bitirdikdən sonra, 1992-ci il aprel ayında Biləsuvar RHK tərəfindən hərbi xidmətə çağırılıb.

S.Hüseynov Vətənə olan müqəddəs borcunu Daxili Qoşunların Gəncə şəhərində yerləşən N saylı hərbi hissəsində sıravi hərbi qulluqçu kimi yerinə yetirməyə başlayıb. 1992-ci ilin noyabr ayından isə qoşunların igid döyüşçüsü kimi Laçın və Füzuli rayonlarının müdafiəsi uğrunda gedən döyüşlərdə fəal iştirak edib.

Vaxtı ilə birgə xidmət etdiyi silahdaşları onu nizam-intizamlı və nümunəvi hərbi qulluqçu kimi bu gün də böyük iftixar hissi ilə xatırlayırlar. O dövrdə Daxili Qoşunların Laçında yerləşən N saylı hərbi hissə komandirinin tərbiyə işləri üzrə müavini olmuş polkovnik Əhliman İlmazovun qəhrəman döyüşçü haqqında söylədiyi xatirələrindən də bunu görmək olar: ***"...Sıravi S.Hüseynovu çox yaxşı tanıyırdım. Qorxunun nə olduğunu***

***bilməyən, yüksək nizam-intizamı ilə fərqlənən igid döyüşçülərimizdən biri idi. Laçının Sarıbaba dağında, eləcə də Fingə, Qozlu, Haqnəzər və Təzəkənd kəndlərinin müdafiəsi uğrunda gedən döyüşlərdə Saleh snayper kimi fərqlənmişdi. O, aparılan hərbi əməliyyatlar zamanı igidlik və şücaət göstərərək qarşıya qoyulmuş döyüş tapşırıqlarını yüksək keyfiyyətlə yerinə yetirib...".***

Daxili Qoşunların veteranı, Qobustan rayonunun Poladlı kənd sakini, ehtiyatda olan leytenant Rövşən Göyçəyev də cəsur döyüşçü ilə birgə Laçında keçən ağrı-acılı günlərini xatırlayaraq, onun əsl qəhrəman kimi xidmət etdiyini bildirdi: ***"Salehlə cəbhə bölgəsinə eyni gündə getmişdik. Mənim komandiri olduğum taqımda xidmət edirdi. Göygöz, ortaboylu, idmançı oğlan idi. Olduqca ciddi, cəsur və mərd döyüşçü olub. Salehlə birgə Laçın rayonunda gedən bir sıra döyüşlərdə iştirak etmişəm. O, bizim snayperimiz idi. Çox sərrast atəş açardı...***

***Yaxşı yadımdadır, 1993-cü ilin yanvar ayının 5-i idi. Erməni yaraqlıları hərbi texnikanın köməyi ilə Təzəkəndə hücum etmişdi. İki gün davam edən bu döyüşdə daşnak qüvvələrinin üstün olmasına baxmayaraq, Daxili Qoşunların və könüllülərdən ibarət Laçın taborunun şəxsi heyətinin qəhrəmanlığı nəticəsində düşmən canlı qüvvə və texnika sarıdan xeyli itki verərək geri çəkilməyə məcbur olmuşdu. Saleh bu döyüşdə 9 erməni yaraqlısını öldürmüş, 7-sini isə yaralamışdır. Bu döyüşdən sonra, onun igidliyi və şücaəti nəzərə alınaraq, manqa komandiri təyin edilmişdi".***

R.Göyçəyev indiyədək qoruyub saxladığı cib dəftərçəsini çıxarıb, Laçında xidmət etdiyi dövrdə öz xətti ilə yazdığı qeydləri mənə göstərir. Dəftərçədə tabeçiliyində vuruşan əsgərlərin adlı siyahısı, ünvanları, eləcə də xronoloji ardıcıllıqla baş vermiş döyüşlər barədə qiymətli məlumatlar qeyd olunub. Burada diqqətimi çəkən ən maraqlı qeydlərdən biri də 1993-cü ilin martın 26-da Təzəkənddə taqımın hər bir döyüşçüsü üçün yazılmış şeir oldu. Bu şeirdə Salehin igidliyini tərənnüm edən dörd misralıq bənd də öz əksini tapmışdı. Şeirin iki bəndini sizə təqdim edirəm:

*Biz Fingədə qardaş olduq,*
*Təzəkənddə qardaş olduq.*
*Ermənidir düşmənimiz,*
*Vuruşuruq ürəklə biz.*

*Təzə ağardı dan yeri,*
*Saleh aldı snayperi.*
*O dağlara qalxdı,*
*Hələ düşmən ayılmamış...*

1994-cü ilin yanvar ayında cəsur silahdaşımız S.Hüseynov qanlı döyüşlərin getdiyi Füzuli rayonuna ezam olunur və Böyük Bəhmənli, Aşağı Yağlıvənd kəndlərinin düşməndən azad edilməsində yaxından iştirak edir.

**18 yanvar 1994-cü il.** Füzuli rayonunun Aşağı Yağlıvənd kəndinin azad edilməsi uğrunda şiddətli döyüşlər gedirdi. Saleh bölmə komandiri kimi tabeçiliyindəki əsgərlərlə birgə düşmənə sarsıdıcı zərbələr endirirdi. Əsgərlərimizin qətiyyətli hücumu qarşısında tab gətirməyən erməni daşnakları xeyli itki verərək, geri çəkilməyə məcbur olmuşdu. Lakin döyüşün sonunda düşmən artilleriyasının açdığı atəş nəticəsində Saleh ağır yaralanır və yanvarın 26-da gözlərini əbədi yumaraq şəhidlik zirvəsinə yüksəlir...

Vətən uğrunda canını qurban verən igid silahdaşımız sıravi S.Hüseynov Bakı şəhərində II Fəxri xiyabanda dəfn olunub. Çaylı kəndindəki mərkəzi küçə şəhid S.Hüseynovun adını daşıyır.

Azərbaycan Respublikası Prezidentinin 10 mart 2016-cı il tarixli Sərəncamı ilə sıravi Hüseynov Saleh İsi oğlu respublikamızın ərazi bütövlüyünün təmin olunmasında iştirak etdiyinə, döyüş zamanı igidlik göstərdiyinə, öz xidməti vəzifələrini və hərbi hissə qarşısında qoyulmuş tapşırıqları yerinə yetirərkən fərqləndiyinə görə "İgidliyə görə" medalı ilə (ölümündən sonra) təltif edilmişdir *(Medal 19.03.2016-cı il tarixdə Daxili Qoşunların Baş İdarəsində təşkil olunmuş təntənəli mərasim zamanı Daxili İşlər Nazirinin müavini – Daxili Qoşunların Komandanı general-leytenant Şahin Məmmədov tərəfindən şəhidin qardaşı Əlixan Hüseynova təqdim olunmuşdur).*

Şəhid S.Hüseynovun həyat və döyüş yolundan bəhs edən yazılara görkəmli ziyalımız Mirzə Müşfiqin Biləsuvar şəhidlərindən bəhs edən "Şəhidlik bir səadət ki..." adlı kitabında, həmçinin Azərbaycan Respublikası Səfərbərlik və Hərbi Xidmətə Çağırış üzrə Dövlət Xidmətinin rəsmi internet saytında (http://seferberlik.gov.az/rgminfoall/1168.html) rast gəlmək olar.

Məlumat üçün qeyd edək ki, Saleh Hüseynovun adı Daxili Qoşunların Arxivində saxlanılan Daxili Qoşunlar üzrə "1992-1994-cü illərdə gedən döyüş əməliyyatları nəticəsində şəhid olmuş hərbi qulluqçuların siyahısı"nda 197-ci sıra nömrəsi ilə qeydə alınması və Füzuli rayonunda həlak olması göstərilib.

Saleh kimi igid silahdaşlarımız Daxili Qoşunların tərkibində xidmətlərini bu gün də şərəflə davam etdirirlər. Sıralarında vətənpərvər oğulların xidmət etdiyi Azərbaycan Ordusu işğal altında olan müqəddəs torpaqlarımızı düşməndən azad etməyə hər zaman hazırdır.

Allah şəhidlərimizə rəhmət eləsin!

**Anar ƏHMƏDOV,**
***Kapitan, Daxili Qoşunların zabiti***

**POEZİYA**

Şəhla VAHİD



## ŞEYTAN APARDI

Yediyimiz nəsə dadır,
Tamını şeytan apardı.
Qaranlıqda işıq gəzən,
Şamını şeytan apardı.

Sən tutaydın barı dilək,
Yarı ümid, yarı dilək.
Bizə qaldı quru dilək,
Kamını şeytan apardı.

Dirilər də ölü çıxdı,
Hər bir işdən əli çıxdı.
Ağıllı zır dəli çıxdı,
Xamını şeytan apardı.

Kim çağırır bizi öndən?
Yolumuzu salıb çəndən.
Olduq candan, olduq dindən,
Hamını şeytan apardı.

## SİRR SAXLAMIR

Gecələrin əli uzun,
Həsrətin oduna qızın.
Sənin də çıxdı buynuzun,
Quyular da sirr saxlamır.

Söküləni tikən olub,
Tikiləni sökən olub.
Canımız yelçəkən olub,
Ruhumuzu tər saxlamır.

Yaş süzüldü yeddi qatdan,
Axdı gözündəki çatdan.
Qaçır ayağımız altdan,
Daha bizi yer saxlamır.

## VƏRƏQƏ KÖÇMƏYƏN ŞEİRİM

Taleyim boynumdan asılı kəndir,
İllər ayağımdan qaçacaq bir gün.
Canıma sığmayan, sıxılan ruhum,
Azadlığa çıxıb uçacaq bir gün.

Kiminsə gözündə yuyulacaqdı,
Xəyalım isti göz yaşının altda.
Yatacaq şəklim gözləri açıq,
Hər gecə kiminsə başının altda.

Bəlkə də şeirim bir ömür boyu,
Kiminsə dilində əzbər olacaq.
Bəlkə bu dünyanı tərk eləməyim,
Kiməsə ən ağır xəbər olacaq.

Vərəqə köçməyən neçə şeirim,
Bitəcək qəbrimdə çiçək əvəzi.
Külək sovurduqca hər bir sözümü,
Səpəcək yollara ləçək əvəzi.

**ZƏRİF QƏHRƏMANLAR**

## XOCALIYA UÇAN DURNA



...İndinin özündə də yarı canı Xocalıdadı. Birdən Xocalıdan elə danışır ki, elə bilərsən ki, doğulub boya-başa çatdığı Bərdənin Əmirli kəndindən – canı qədər bağlandığı yurd yerindən – söhbət açır. Nə qədər danışıb-gülsə də (öz aramızdı, gülmək Familəyə çox yaraşır) gözlərinin qarasından boylanan dərdlərini fəhmli adamlardan gizlədə bilmir. Xüsusən, dərdlərinin dərdi Xocalı dərdini... Tez-tez o müqəddəs dərdini (və ya dərdlərinə) bülənd olub xəyalən tənha durna kimi ilin-günün bu vaxtında xaraba qalmış, tarmar olmuş Xocalıya sarı uçur. Bəlkə də günün çoxunu ana qucağıtək sevdiyi Xocalının Qaladərəsi kəndində – müəllim işlədiyi və könüllü döyüşçü kimi xidmətə başladığı Xocalı Milli Ərazi Özünümüdafiə taborunun yerləşdiyi kənddə keçirir. Düşünməkdən və xatirələr ekranında gəzişməkdən bezdiyi zaman, bir neçə il bundan əvvəl isindirə bildiyi – Bakının Abşeron rayonunun Masazır kəndindəki xeyməsinə qayıdır. Ona görə ədəbi dillə danışıram ki, Familə müəllim olmaqla yanaşı, həm də şairdi axı. Şair də ki sirli-sehrli duyğuların tərcümanıdı deyirlər. Bildiyimə görə, Familənin bir kitablıq şeirləri var. Oğul istəyir ki, o qanadlı duyğulara ürək versin, can versin və geniş səma versin uçmağa. Axı o duyğuların çoxu Xocalıyla – o əsir şəhərin tarixi döyüş səhnələriylə bağlıdı.

Yadımdadı, 1991-ci ilin payızıydı. Bir vaxtlar "Addımlar" dərnəyinin şeir müzakirələrində (ayda iki dəfə keçirilirdi) rastlaşdığımız, təzə şeirlərini dinlədiyimiz bu üzügülər qız, yağlı əppəyə dönüb yox olmuşdu. "Bərdə" qəzetinin nəzdində fəaliyyət göstərən "Addımlar" dərnəyinin bütün üzvləri bir-birinə "dəymişdi". Hamı ondan nigaran və xəbərsizdi.

Günlərin birində səhər-səhər işə gedirdim. Təxminən noyabrın sonlarına yaxın zamanlar idi. Fikirli-fikirli nəyisə götür-qoy edir, nəsə mücərrəd bir şey haqqında düşünərkən kimsə hərbi paltarda adımı çəkib sevincək məni səslədi. Dönüb baxdım, o idi, Familə. Əvvəl gördüklərimə inanmaq istəmədim... Sonra səsindən, təbəssümündən, aydın – səlis nitqindən, kükrəyən sevincindən yəqin elədim ki, bu, doğrudan da döyüşçü, müxbir, şair Familə Fərmanlıdı. İlahi, bu nəydi, mən rastlaşdım. Qızın hiss edib-etmədiyini deyə bilmərəm. Qarşımdakı hərbi paltarlı qızın yerində mən olmalıydım – hərbi formada, əlində avtomat. Hər vəchlə ondan qaçmaq istəyirdim. İçimdə dəhşətli utanc hissi baş qaldırmışdı. Xəcalətimdən bilmirdim nə edəm...

Sonralar Familənin Xocalıdan gəlişi seyrəlməyə başladı. Bir dəfə görüşümüz zamanı dedi ki, Əsgəran ermənilәri Ağdamla Xocalı arasındakı yolu beton panel örtüklərlə bağlayıblar. Əlac ancaq hava yoluna qalıb. Və bu da çox təhlükəlidir. Yəni, Familə Xocalı taboruna ərzaq və tibbi çantaları hərbi vertolyotlarla aparır. Bu məşəqqətli günlər və aylar xeyli davam edir... O, birinci dəfə Xocalı aeroportunda yaralananda (qrad qəlpəsindən) Milli Qəhrəman Tofiq Hüseynovun köməkliyi ilə Ağdama, oradan isə Bərdə xəstəxanasına çatdırıldı... Sağalanda Xocalının düşmən tərəfindən zəbt olunuduğunu eşidib sarsılır... Ümid sonuncu ölür axı...

Bu dəfə özünü səfərbər edərək, Ağdam bölgəsində döyüş yolunu davam etdirməyə qərar verir. Ağdamda xidmətdə olduğu müddətdə bir gün Bərdəyə gələrkən onunla rastlaşdım – Bərdənin girəcəyində. Artıq Familə təcrübəli bir əsgər idi. Ona yazdığım şeirin bir bəndini oxudum:

*...Havalı güllələr nifrətə səsləyir,*
*Torpaq azadlıq istəyir,*
*Qələbə gözləyir.*
*Yumruğunda şimşək əzəməti,*
*Oğul qeyrəti,*
*Təpədən-dırnağa oğuldu bu qız,*
*Nəbi babamın Həcər nağılıdı bu qız,*
*Bir qız addımlayır səngər yuxarı...*

– Kim yazıb bu şeiri? – soruşdu. Sonra gülümsünərək: – Kim yazıb sağ olsun!

Bir qədər susdu. Baxışlarını yerə söykədi. Hiss elədim ki, kövrəlib, ağlamaq istəyir. Handan-hana: “O bəndi bir də oxu!” – dedi... Oxudum... “Çox sağ ol!” – deyib uzaqlaşdı.

Sonralar – 1994-cü ildə çap etdirdiyim “Elçi daşı” kitabımda “Bir qız addımlayır səngər yuxarı” şeiri döyüşçü, şair Familə Fərmanlıya həsr olunmuşdu.

... Pircamal kəndində – Ağdam bölgəsində gərgin döyüşlərdə Familənin ikinci dəfə yaralandığını çox gec bildik. O zaman döyüşdə yaralanmaq o qədər də böyük və qabarıq görünmürdü. Çünki, o qansız döyüşlərdə ölənlər o qədər çox idi ki, ölüm və ölmək o qədər adi idi ki, yaralanmaq sözü o qədər də diqqət çəkmirdi... Hər halda Familə nə yaxşı ki, yaralanmışdı, sağ idi... Və bu qəhrəman qız Bakıda müalicəsini qurtarıb doğma Bərdəmizə qayıtdı.

**Haşiyə:** Oturub çay içirik Familənin Masazırdakı xeyməsində (odasında). Onun haqqında müxtəlif qəzetlərdə, jurnallardakı yazılara: məqalələrə, şeirlərə, oçerklərə baxıram. Müxtəlif fotoşəkillərə baxıram – müxtəlif illərin fotoşəkillərinə. Və düşünürəm ki, bu döyüşçü, Xocalı döyüşləri zamanı "Aydınlıq" qəzetinin müxbiri, şairə xanım hələ də lazımi qayğıdan və diqqətdən kənarda qalıb. Hələ də onun haqqında sanballı, populyar, sayılıb-seçilən mətbu orqanlarda ürək dolusu, ciyər soyudan bir yazı yazılmayıb. Bəlkə Allah qismət elədi! Familə, bir az da döz görək!

**SON SÖZ YERİNƏ**



...Bu yaxınların söhbətidi. Təsadüfən onların dayanacağından (Masazıra gedən avtobusun dayanacağından) keçirdim, gördüm Familə don vurmuş ağac kimi dayanıb, harasa uzaqlara baxır... Başa düşdüm. O, Xocalıya uçmuşdu, hələ dönməmişdi. Bir az da tənha, qanadları yorulmuş durnaya bənzəyirdi... Dindirmədən ötüb keçdim...

**Rizvan NƏSİBOĞLU**

**İDMANÇILARIMIZ**

**FƏXRİ KÜRSÜLƏRİN GƏNC SAKİNİ**



Hüseynov Elçin Elxan oğlu 28 sentyabr 1988-ci ildə Azərbaycanın cənnət muzeyi olan Laçın rayonunun Kamallı kəndində dünyaya göz açıb. O, 1995-ci ildə Nəsimi rayonu 240 saylı tam orta məktəbin 1-ci sinfinə gedib. 2006-cı ildə həmin məktəbi bitirərək Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyasına qəbul olub. 2010-cu ildə ali təhsilini başa vuraraq, Milli Ordumuzun sıralarında həqiqi hərbi xidmət keçib. Hərbi xidmətdən qayıtdıqdan sonra Azərbaycan Respublikası Daxili İşlər Nazirliyi Baş Mühafizə İdarəsində işə

başlayıb. Uşaq vaxtlarından onun idmana olan həvəsi gələcək karyerasına təsirsiz ötüşməyib. Əvvəlcə o, Neftçi İdman və Sağlamlıq Kompleksində idmanın klassik güləş növü ilə məşğul olub. 2002-ci ildə yeniyetmələr arasında keçirilən Bakı birinciliyində 3-cü yer tutub. 2005-ci ildə Azərbaycanın Milli Qəhrəmanı Ə.Əliyevin xatirəsinə həsr olunmuş respublika turnirində 3-cü yer, 2006-cı ildə isə 1986-1988-ci il təvəllüdlü gənclər arasında keçirilən Bakı birinciliyi turnirində 1-ci yerə layiq görülüb.

2007-ci ildə "Təhsil RİM"-nin açıq çempionatında 1-ci yerə çıxan E.Hüseynovun klassik güləş karyerasında sonuncu və yadda qalan uğuru 2009-cu ildə Neftçi İdman və Sağlamlıq Kompleksində keçirilən açıq çempionatda qazandığı nəticədir. Belə ki, E.Hüseynov fəxri kürsünün ən yüksək pilləsinə qalxmağı bacarıb. E.Hüseynovun peşəkar güləşçi kimi yetişməsində Əməkdar məşqçi Əliqulu müəllimin böyük zəhməti var.

E.Hüseynov hərbi xidmətdən qayıtdıqdan sonra qaydasız döyüşün MMA növünə xüsusi maraq göstərib. İdmanın bu növü üzrə onun ilk uğuru 2012-ci ildə Gürcüstanın paytaxtında keçirilən yarışda Dünya Kubokuna layiq görülməsidir. 2013-cü ildə isə Ukraynanın Odessa şəhərində Avropa çempionatında fəxri kürsünün ən yüksək pilləsinə qalxıb. Beynəlxalq yarışda Azərbaycanın üç rəngli bayrağı ucalıb, himnimiz səsləndirilib.

2014-cü il dekabrın 5-də Elçin Hüseynov Ukraynanın Xarkov şəhərində Şaulin Federasiyasının iştirakı ilə qaydasız döyüş növü üzrə 36 ölkənin idmançılarına qoşulub. 17 nəfərlik heyətə baş məşqçi Ruhi Hüseynov başçılıq edib. Elçin Hüseynovun ilk döyüşü moldovalı idmançı ilə olub və idmançımız boğucu fəndlə qalib gəlib. E.Hüseynovun ikinci döyüşü erməni idmançısı ilə baş tutub. İdmançımız 47-ci saniyədə erməniyə heç bir şans verməyərək nakautla qalib gəlib. Final döyüşü isə yerli idmançı ilə olub. Elçin ilk görüşdə zədələndiyinə baxmayaraq, finalda döyüşüb və 2-ci yeri qazanıb.

2015-ci ildə Gürcüstanın paytaxtında peşəkarlar arasında keçirilən dünya kəmərinin və Moldovada "Dünya Kəmərinin Müdafiəsi" yarışının qalibi olub. 2016-cı ildə Polşanın paytaxtı Varşava şəhərində keçirilən Avropa kubokunun qalibi olub.

Elçin Hüseynov hal-hazırda Bakı şəhərində yaşayır. Ailəlidir, bir qız övladı var.

**Təqdim etdi: Lətif FƏRMANOV**

AXTAR BABALARI

## KƏRBƏLAYİ RAMAZAN



Yuxular insana gələcəklə, yaxud keçmişlə bağlı informasiyaların çatdırılmasında bir vasitədir. Mən belə düşünürəm.

Köçkünlüyün ilk illəri idi. Bərk xəstələnmişdim. Başım çox ağrıyırdı. Heç yata bilmirdim. Bir dəfə günorta yeməyindən əvvəl dərin yuxuya getdim. Yuxuda nurani bir qoca mənə yaxınlaşdı. Dedi: "Qızım, sən sağalacaqsan, hələ sən insanlara lazımsan. Yenə öz yolunla – elm yolu ilə gedəcəksən. Bu yol sənin yolundur, get!"

Yuxudan ayıldım. Yuxuda sağalacağım haqqında "deyilən sözlər" gələcəyə inamla yolumu davam etdirməyə sanki məni ruhlandırdı.

Doğrudan da, bu dünyada hər kəsin gedəcəyi bir yol var. Bu yolların başlanğıcı eynidir. Bu başlanğıcda insanlara elm və din adlanan iki məfhum yardım edir. Elm bir məşəldir, alovu çox olduqca yolları daha aydın işıqlandırır. Məqsəd və hədəfi doğru olan yollara nur saçmaqdır. Din isə elmin nur işığında insanlıq yollarını insanlara tanıtmaq, bu yollarda onları rahatlıqla yolun sonuna çatdırmaqda yardımçı olmaqdır.

Kərbəlayi Ramazan. Onun adı onu tanıyanların qəlbində doğru bir yol yolçusu kimi qalmışdır. Elmi olmasa da, Yaradana olan məhəbbəti, insanlara örnək olan insanlığı ilə tanındı Kərbəlayi Ramazan. Kimdir Kərbəlayi Ramazan?...

1920-ci il idi. Ermənilərin Zəngəzur mahalında günahsız azərbaycanlılara qarşı amansız qırğınlarının tüğyan etdiyi bir dövrdü. Ermənistanın Sisyan rayonunun Urud kəndində Ramazan adlı kişi arvadı Sona xanım və oğlu Seyfəddinlə birlikdə səksəkə içində ömür sürürdü. Hər an üzləşəcək təhlükə ilə qarşılaşmamaq üçün ayıq-sayıq olmaq lazım idi.

Yazın gözəl çağı idi. Zeynəb qızına hamilə olan Sona xanım həyətdə 4 yaşlı oğlu yanında çörək bişirirdi. Evlərində qonşu Şəki kəndindən qonaq gəlib xəstə yatan vardı. Qəflətən kənddə səs-küy qopur, xəbər yayılır ki, ermənilər kəndə od vurub. Heyvanlar örüşdə idi. Evdə bir mal düyəsi var idi. Sona xanım onun ipini qoluna bağlayır, ailə yola düşür. Ancaq çörək götürmək yaddan çıxır. Sona xanımın qardaşı Məhərrəm əsir düşür.

Ailə min əziyyətlə gəlib Laçın rayonu ərazisində yerləşən "Eşşək meydanı" deyilən əraziyə çatırlar. Oradan Qarakeçdi kəndindən keçəndə Kərbəlayi Ramazanın oğlu su istəyir. Ancaq Kərbəlayi Ramazan oğluna su

vermək üçün bulağı tapmır. Sonralar Qarakeçdi kəndinə hər gedəndə oğluna vaxtilə su tapıb verə bilmədiyinə görə heç vaxt o bulaqlardan su içmir.

Kərbəlayi Ramazanın ailəsi Minkəndə gəlir. Bir həftə Minkəndin qız-gəlini onların əllərinin tikanını artlayırlar. Köçkün gələn insanlar hərə bir tərəfə üz tutur. Sona xanımın qardaşları Daşkəndə, bacıları isə Ağdama gedirlər. Onlar da Alxaslı kəndinin yanındakı Şəvəkar adlanan yerə gəlirlər. Sonra Alxaslı kəndinə, daha sonra isə Mişni kəndi ilə Alxaslı kəndi arasında yerləşən Seyidlər kəndinə gəlib orada birotaqlı evdə öküz palanının arasında yatırlar. Ancaq tale çox amansız olur. El arasında "Göyərtmə" deyilən xəstəlik ailənin yeganə oğlunu onların əlindən alır. Kərbəlayi Ramazan oğlunu Seyidlər kəndində torpağa əmanət verir.

Kərbəlayi Ramazana məsləhət görürlər, gedir Sultan bəyin atası Paşa bəyin yanına. Paşa bəy yaylaqda idi. Kərbəlayi Ramazanı hörmətlə qarşılayır. Qoyunların yununu, pendirini, digər məhsullarını yüklədir atlara, kəndə göndərir ki, özlərinə yorğan-döşək düzəltsinlər.

Kərbəlayi Ramazan 30-cu illərə qədər yeddi dəfə piyada İraqın ən böyük şəhərlərindən biri, Bağdaddan 100 km cənub-qərbdə yerləşən müqəddəs Kərbəla şəhərinə ziyarətə gedib-qayıdır. Axırıncı dəfə gedəndə, bolşeviklər bu kişini hədələyir, təqib edirlər. Şuşada onu bolşevik Ocaqqulu tutulmağa qoymur.

Kərbəlayi Ramazanın Seyidlər kəndində dörd qızı – Zeynəb, Safa, Mərvə və Fizzə adında qızları dünyaya gəlir. Hər dəfə qız övladı dünyaya gələndə qurbanlıq olaraq bir qoyun kəsib camaata paylayır. Naxçıvanda Əshabi-Kəhfə ziyarətə gedir. Üç gün orada qalır. İnanclı olduğundan, oğlu olması üçün dualar edir. Ancaq gözlədiyi "damcı" düşmür. Allahın verdiyi dörd qız övladına şükürlər diləyərək geri qayıdır.

Vaxt gəlir, Seyidlər kəndinin əhalisi başqa yerlərə köçürlər. Kərbəlayi Ramazan qızlarına görə Mişni kəndində yaşamağa üstünlük verir. Köçüb Mişni kəndində "Tağıların yeri" deyilən ərazidə yaşamağa başlayır. İsmayıl babam onlara iki ev və bir dam tikir. Heyvanları da gətirirlər. Qışda kənddə, yayda kənd ərazisindəki "Çökəklər" adlanan yerdə heyvanlarını saxlayıb ailəni dolandırırlar. Hələ Seyidlər kəndində olarkən, kəndin hörmətli ağsaqqalı Murğuzov Heydər onlara kömək durduğu kimi, burada da onlara hayan olur.

Kənd camaatının Kərbəlayi Ramazan haqqında söylədikləri: "Kərbəlayi Ramazan təkcə Həzrəti-Abbas nəziri yığıb. Özü heç vaxt heç kimdən nəzir istəməyib. Nəzir veriləndə onu dörd yerə bölüb, bir payı götürərdi. Qalanını kəndin uşaqlarına, ya da imkansız ailələrə verərdi. Orucunun vaxtını keçirməzdi. Əlində deyilənə görə şəfa var idi. O qədər həyatsevər, təbiətsevər idi ki, ömründə bir yaş ağac kəsməmişdi. Meşəyə gedəndə, ancaq quru odun gətirərdi. Böyük ağacın, hündür qayanın yanından keçəndə onlara sitayiş edər, uca-

lıqlarına baş əyərdi. Kim ondan nə istəsə, əgər varıdırsa, heç vaxt ona “yox” deməzdi. O qədər insanpərvər adam idi ki, kimliyindən asılı olmayaraq, ona əl verib salamlaşardı. Danışanda danışığına xüsusi fikir verər, xətrə dəyəsi heç bir söz deməzdi. Heç vaxt dünya malına tamah salmazdı. Gözəl ailə başçısı idi. Həyat yoldaşı Sona xanım da insanpərvərlikdə, həyatsevərlikdə əri Kərbəlayi Ramazandan geri qalmırdı. Həddindən artıq qonaqpərvər idi. Mişni kəndində hamının hörmətini qazanmışdı. Çox əliaçıq, qəlbi gen adam idi.”

Kərbəlayi Ramazan haqqında çox maraqlı əhvalatlar danışılır. Onlardan ikisini sizə çatdırıram:

Bir gün Kərbəlayi Ramazan kənd adamları ilə birlikdə Minkənd bazarına gedir. Qayıdanda iki quş onun çiyinlərinə qonur. Şahidlərin dediyinə görə Kərbəlayi Ramazan gəlib evinə çatana qədər quşlar onun çiyinlərindən düşmür. Sonra quşlar uçub gedirlər.

Bir gün yenə Kərbəlayi Ramazan Minkənd bazarına gedir. Birdən hiss edir ki, ayağını nəsə incidir. Yol gəldiyinə görə ayağının ağrıdığını düşünür və əhəmiyyət vermir. Qayıdıb kəndə gələndə çarıqlarını çıxarır və görür ki, çarığına bir daş parçası düşüb. Ayağını ağrıdan bu imiş. Daşı götürüb təzədən Minkənd bazarına qayıdır. Onu bazarda yerə qoyub deyir: “ Mən vətəndən ayrı düşməyin nə olduğunu bilirəm. Heç olmasa, sən bilmə”.

Ömrünün çox hissəsini qəriblikdə keçirən Kərbəlayi Ramazanın arvadı Sona xanım 1958-ci ildə, Kərbəlayi Ramazan isə 1976-cı ilin aprelində dünyalarını dəyişiblər. Hər ikisi Seyidlər qəbiristanlığında oğullarının yanında dəfn olunublar. 1992-ci ilədək onun qəbri həmişə ziyarət olunub, o vaxta qədər ki, vətənindən qaçqın düşüb sığındığı Mişni kənd camaatının özlərinin də köçkünlüyə düçar olduqları o günədək. İndi də qohumlarının evlərində olan şəkillərinə inanclı adamlar nəzir deyirlər. Qohumları isə verilən bu nəzirləri imkansız adamlara verirlər.

Bu da bir yolun sonu. Ağrılı, acılı, şirinli bir yol yolçusunun tarixçəsi. Dərk edə bilmədiyimiz yuxular hələ çox şeylərdən söhbət açacaq, fikirlərimiz çox qarışacaq. Əsas odur ki, görəcəyimiz yuxulardakı rənglər aydın olsun, oyananda, yuxularda gördüyümüz əsrarəngiz rəng çalarları içərisində insanlığa rəvac verən rəngləri seçməklə müqəddəs yolun sonuna gedib çata bilək.



Yolun sonu hamımızı gözləyir...

**Venera MİRZƏYEVA,**
***Laçın rayon 7№-li tam orta məktəbin riyaziyyat və informatika müəllimi***

**POEZİYA**

**Dilafət RƏSULOV**



## QARABAĞIN QARA BAXTI
*(poema)*
**(əvvəli ötən sayımızda)**

### ŞUŞANIN İŞĞALI BARƏDƏ
### 08.05.1992

Sənətkar oylağı o, gözəl Şuşa,
Qarabağ üzüksə, o, bənzər qaşa.
Allah rəhməti, Pənahəli xana,
İnşa eyləyibdi bir zaman bina.
Elə vurğun idim Cıdır düzünə,
Dəyişməzdim onu Qarun mülkünə.
Dünyada məşhurdu o, xarıbülbül,
Ancaq orda bitir o, dediyim gül.
İsa bulağının suyundan içib,
Neçə sənətkarlar orda yetişib.
Üzeyir elə bir böyük bağ idi,
Bütün Azərbaycan barından yedi.
Bil, qışın günü oxusaydı Bülbül
O gün qönçələnib açılardı gül.
Yaman qüdrətliymiş musiqi inan,
Adi bir insanı eyləyibdi xan!
Zildə oxuyanda həmişə Cabbar,
Bütün xanəndələr tez susardılar.
Seyidin segahı bir dəniz idi,
Ləpəsi insana həyat verirdi.
Belə sənətkarlar orda çox olub,
Dünyada tayları bilin, yox olub.
Ancaq tam başqadı könlümdə məqsəd,
Bir neçəsin saydım düşmüşdü fürsət.
Nə yaman bəladır hərb və siyasət,
Dünyanı yerindən oynadar əlbət.
Qapı tulaları o, ermənilər,
Gəlib Şuşaya da gözün dikdilər!
Bakıda yenə qarışmışdı ara,
Camaat da artıq gəlmişdi zara.
"Prezident olacam" – çoxu deyirdi,
Vətəndən də çox, kreslo sevirdi.
Erməniyə düşmüşdü elə fürsət,
Yatsa yuxusuna gəlməzdi əlbət.
Hərbi nazir Rəhim Qazıyev idi,
Qazından o vaxtı belə söylədi:
"Şuşaya erməni girərsə əgər,
Bu, Rəhim Qazıyev özün güllələr!".
Hücum hazırlandı kənd Daşaltına,
Vaxtı məlum idi hər bir insana.
Şəhərdə, rayonda, kənddə, küçədə,
Qürurla söylərdi onu hər sadə...

Gecə Daşaltına hücum ediblər –
Şəhərdən enərək gözdən itiblər.
Xainlər düşmənə parol veriblər –
Ordumuz tərpənib, gəlir deyiblər.
Bizimkilər tamam itirib başın,
Gülləyə tutdular öz yoldaşların.
Kimsə bağırıb ki, – atma, bizimdi,
Eləsi oldu ki, çığırıb, – cindi!
Xülasə, başlayıb möhkəm atışma,
İgidlik sayılıb aradan çıxma.
Orduda varmış şəhər uşaqları,
O günü görürmüş meşə yolları...
O gün Daşaltını alammadılar,
Böyük itki verib gəlib çıxdılar.
Bu itki ordunu salmışdı ruhdan,
Bəzisi görürdün çıxdı aradan...

Şuşa alındığın eşidən zaman,
Əlimi tam üzdüm qoca dünyadan!
İlahi, belə də dəhşət olardı!
Qırğı caynağında qartal apardı!!
Sandım ki, ordumuz od püskürəcək,
Tezliklə Şuşanı azad edəcək.
Ancaq ötüb keçən bir həftə, on gün,
Eşitmədim belə xəbər, belə ün.
Təhlükə Laçına yaxınlaşırdı,
Dişlər dodaqlara qan ağladırdı!
Çoxu köçürürdü qadın-uşağı,
Tapdaq eyləyirdi torpağı yağı.
Katibin yanına getmiş ağsaqqal,[1]
Onu bir balaca eyləmiş sual...
“Qadın, uşaqların çıxmasını mən,
Demişdi: – özüm məsləhət billəm”.

**Haşiyə:** *Laçından əhalinin köçürülməsi barədə hələ 12.05.1992-ci il tarixli Nazirlər Kabineti fərman veribmiş.*

Beləcə açıldı köçün qabağı,
Görəndə cürətə gəlirdi yağı...

**Haşiyə:** *Respublikanın müxtəlif yerlərindən rayona çoxsaylı maşın karvanları göndərilmişdi.*

## LAÇININ İŞĞALI BARƏDƏ

Bir vaxt yaşayırdım doğma Laçında,
Həkəri çayının qaynaqlarında.
O bölgə adlanır Şəlvə dərəsi,
Ceyran-cüyür oylağıydı bərəsi.
Bu ad da, verilmişdi on bir kəndə,
Mən də yaşayırdım onun birində.
İmanlar kəndiydi bizim kəndimiz,
Qayğısız yaşardıq, yoxdu dərdimiz.
Lakin lağ etdiyimiz ermənilər,
Bir gün aşımıza qatdılar zəhər...
Camaat toplaşar tez-tez bir yerə,
Dərman axtarardıq biz bu zəhərə.
Məsləhət oldu ki, özünə güvənən,
Meydana toplaşsın günü səhərdən.
Sovet sədri Rafiq müəllim idi,
Bu tədbiri özu təklif edirdi.
Ağsaqqal sözünə bircə kəlməyə,
Cavanlar toplaşdı hamı Şəlvəyə.
Hər kənddən gəlmişdi neçə növcavan,
Silahlı idi, kahalı Vəzirxan.
Dörd silah sarımışdı bədəninə,
Beşaçılanı aşırmışdı belinə.
Toylarda yaraşar tar Vəzirxana,
At minsə, bənzərdi Giziroğluna!
Biz iki qardaş da birgə gəlmişdik,
Kolxoz maşınının üstə minmişdik.
Maşının kuzası darısqal idi,
Gedənlər çoxuydu, maşın azıydı.
Rafiq müəllim, bu an məni səslədi,
Ucalmış səsini bir az pəslədi:
“İki qardaşsınız, biriniz qalın,
Ev-eşiyinizə, uşağa baxın”.
Dəyərli insanı dərhal anlardım,
Maşından ensəm də, pərişan qaldım.
Gedənlər minmişdi yük maşınına,
Maşın da yön aldı üzü Laçına.
Qadınlar arxadan su atırdılar,
Kövrəlib, qəmlənib ağlayırdılar...

Bu məğrur gəncləri görüb komissar,
Demişdi: “bunlara heç gərəkmi var.
Bizim ordumuz var, əsgərimiz var,
Vətəni dar gündə onlar qoruyar.
Yığıb gətirmisiz mülkü adamlar,
Döyüşə bilməzlər, bunlar xamdılar”.
Cavanlar dözməmiş, ona hirslənmiş,
– Bizə silah verin!
– Demiş, göynəmiş.

---

[1] 13.05.1992-ci il tarixdə

"Gəlib çənəmizə dirənib yağı,
Bir addım da görmür gözün qabağı".
Bu zaman komissar sənəd istəmiş,
Hərbi biletlərə baxmış, axtarmış.
Çoxunun götürmüş hərbi biletin,
Anladıb ki, indi qayıdın gedin.
– Lazım olan kimi... söz verib düzü,
Döyüşə çağırram bir başa sizi...

Rəşid Macarlarda əsgər olmuşdu,
İki il tank üstdə yerin tutmuşdu.
Neçə sınaqlarda o, yarışmışdı,
Hamısından Fəxri fərman almışdı.
Qardaş olduğuna tərif etmirəm,
Sizə açmaq üçün mətləb deyirəm:
Neçə belələri kənarda qaldı,
Yağı silahlandı torpağı aldı.
Qəlbdə vətən, arxada ana, uşaq,
Qabaqda erməni – o qandan qorxaq.
Əgər silah verilsəydi elimə,
Düşmən ayaq basammazdı yerimə!
Avara qoyanlar, o cür gəncləri,
Laçını xar etdi, bax eləlləri!
Sonra da hamımız düşdük didərgin,
Həyat zindan oldu, yaşamaq çətin...

***

O dağlar qoynunda yaşayan Laçın,
Bir zaman yaxmışdı ordusun xaçın.
Sultan bəy onlara qan uddurmuşdu,
Qalan təslim olmuş qaçan "udmuşdu".

Andranik məktub yazıb Sultana,
Deyibmiş ki, yol ver keçim ormana.[1]
Bu sözdən Sultan bəy qəzəblənmişdi,
Qardaşı Xosrovun yanına gəlmişdi.
Qubernator idi Xosrov Şuşada,
İlk hərbi nazir də olub orduda.

[1] Qarabağa

Xosrov bəy böyük siyasətçi idi,
Bütün Avropanı gəzib gəlmişdi.
Məsləhət eylədi o, Sultan bəyə,
Gedib xəbər eylə tayqulaq səyə:
– Əvvəlcə silah verin ki, siz bizə,
Qoymayaq bir kimsə toxunsun sizə.
Silahı alandan sonra ay qağa,
Söylə buyur, di keç, gəl Qarabağa.
Sultan bəy anladı iş nə yerdədi,
Arifi anladan bir işarədi.
İgidlər topladı hər bir bölgədən,
Bir az siyahıdan gərək göstərəm:
160. Fətayev Qoca Camal oğlu – Hacıxanlı kəndi
161. Məhərrəmov Rza Alxan oğlu – Hacıxanlı kəndi
162. Quluyev Bəhrəm Dağbəyi oğlu – Hacıxanlı kəndi
163. Əli İmanoğlu – Hacıxanlı kəndi
164. Məmmədov Hidayət Şaməmməd oğlu – Hacıxanlı kəndi
165. Xəlilov Hilal İlyas oğlu – Çıraqlı kəndi...[2]
Alanda silahı Andranikdən,
Söylədi: – buyur keç, burdan sürüynən.
Nal şəklində də qurulmuşdu pusqu,
Burdan keçəmməzdi ən böyük ordu.
Zabux dərəsində kəsib qabağın,
Qırdılar çoxunu burda yağının.
Ordudan az adam salamat qaldı,
Arxaya baxmadan Gorusa qaçdı.
Andranik hamıdan bərk qaçırdı,
Güc ilə qurtulmuş sonra yazırdı.
Yenə toplasa da nə qədər ordu,
Bütün döyüşlərdə o, məğlub oldu.

[2] Siyahı (1-326) "Xalq Qəhrəmanı Sultan bəy" kitabından götürülmüşdür.

**KƏLBƏCƏRİN İŞĞALI BARƏDƏ**
**02.04.1993**

O dağlar qoynunda salınan şəhər,
Bilmirdi başına gələcək nələr.
Alınmaz qalaydı Şəmşirin yurdu,
Düşmən fitva verdi, min hiylə qurdu.
Bu yerlərdə mədən vardı hər dağda,
Belə bir məkan yoxdu dünyada.
Qızıl, gümüş yatağıydı torpağı,
Qarabağın yaylağıydı yaylağı.
Aranda qışlayan bütün mal-qara,
Yazda üz tuturdu yaylağa, dağa.
Haylı, küylü idi baharda dağlar,
Bəyə bənzəyirdi burda çobanlar.
Bu torpaqda olan dəmir, mis qədər,
Eşitmədim nə bir ölkə, nə şəhər.
Sanatoriya vardı İstisuyunda,
Şöhrəti var idi onun hər yanda.
Müalicəyə gəlirdilər hər yandan,
Dünyada inan ki, yoxdu o sudan.
Hər gələn orada şəfa tapırdı,
Odur ki, şöhrəti tez yayılırdı.
Bu torpaqda vardı bolluca sərvət,
Yağıda da varmış gizli pis niyyət.

**Haşiyə:** *İsrail Musayev göstəririr ki, Kəlbəcərdəki Misqaynaq dağında yerləşən qızıl yatağını ermənilər müxtəlif yalan və hiyləgərliklə hələ sovetlər dönəmində ələ keçirməyə çalışıblar. İş o yerə çatıb ki, Tiflisdə Geodeziya Dövlət Nəzarəti Şöbəsinin rəisi işləyən Qabrielyan soyadlı bir ermənin vasitəsi ilə nəşr olunan bütün xəritələrdə Ermənistanla Azərbaycan arasında Misqaynaqdan keçən sərhəd xətti pozulub. Qəbul olunmuş qaydaya görə, dövlətlər arasında sərhəd xətti dağlıq ərazidə dağların zirvəsindən keçir. Qabrielyan isə çalışıb ki, sərhəd xəttini bacardıqca Kəlbəcər tərəfə "sürüşdürsün". Əgər xətti cəmi 200 metr sürüşdürmək mümkün olsa, Misqaynaqda Azərbaycan tərəfdəki qızıl ehtiyatları 25-30 faiz ermənilərin əlinə keçəcəkdi. Yaxşı ki, Moskvada saxlanılan irimiqyaslı (100 minlik) toxunulmuş xəritə nüsxəsinin üzünü müxtəlif kanalların köməyi ilə çıxarmaq və xəritələrdə qəsdən buraxılmış qeyri-müəyyənliyə son qoymaq mümkün olub. 2457 m yüksəklikdə olan Misqaynağın Azərbaycan tərəfindəki qızıl ehtiyatı həmin yatağın ümumi qızıl ehtiyatının 65 faizini təşkil edir. Ermənistan Qarabağdan Kəlbəcərə gedən yol üçün döyüşlərdə xüsusi canfəşanlığı səbəbsiz deyilmiş.*

**Haşiyənin mənbəyi:**
*Calal Mahmudov, "İstehsalat sahələrinin texnologiyası və sənaye ekologiyası". Bakı, "ADİLOĞLU", 2001*

Laçını edərkən erməni işğal,
Dişi qana batmış, qudurmuş çaqqal.
Bir il sonra Kəlbəcərə cumdular,
Hələ ayılmayıb başçı, duydular.
O vaxt yayılmışdı belə bir söhbət,
Gərəkdir söyləyəm, düşübdü fürsət.
"Qarabağ bizimdir" – erməni deyir,
Dünya bu səhnəyə tamaşa edir.
Kəlbəcər Qarabağdan kənardır,
Onun Qarabağa nə dəxli vardır.
Əgər girsə Kəlbəcərə dığalar,
Onlar işğalçıtək dərhal tanınar.
Guya bu nağılı söyləmiş türklər,
Sən saydığından çox saymış fələklər.
Bir kənar bəndəyəm siyasətdən mən,
Bunu uydururam eşitdiyimdən.
Bir məsəl bilirəm ancaq, əskidən,
Düz çıxır bulaq başında söylənən.

Kəlbəcər vuruşdu cavanlarıynan,
Neçə igidləri keçdi canından.
Əsirlik dərdini anlayan, qanan,
Neçə qadın atdı özün qayadan.
Hiylə işlədərək yenə də yağı,
Helekopterə asırlar bizim bayrağı,
Gəlib Kəlbəcərdə enirlər yerə,
Camaat toplaşan, yığışan yerə.
Guya kı, Bakıdan bunlar gəlirlər,
Arvad-uşaqları xilas edələr.
Yığıb aparırlar gənc qadınları,
Tapdanır ölkənin namusu, arı!
Yazanda inan ki, mən bu sətiri,
Tutmuşam başıma qadın çətiri.
Necə yuxum gəlib bu neçə illər,
Necə yaşamışam ötən fəsillər!
Türkəm, gör başıma gəlibdir nələr,
Qorxuram lal ola danışan dillər!
Başına gəlsə də, o vaxt Çingizxan,
Min kərə almışdı qisas yağıdan.
Əslini soruşub əgər axtarsan,
Görərsən olduğun türkün soyundan.
Gərək almayınca qisasa qisas,
Ölkə matəm tutub saxlayaydı yas!
Alçaq siyasətə nifrət edirəm,
Tapdandıq... dünyadan köçüb gedirəm.
Belə bir töhməti kim çəkə bilər,
Yaşamaq olubdu ölümdən betər...
Nə qədər döyüşüb göstərdi hünər,
Ancaq süqut etdi sonda Kəlbəcər.
Yandı, elə yandı bir də Sücaət,
Gəldi yalan oldu o ilk məhəbbət.
Çox pərişan gördüm Məmməd Aslanı,
Elə bil, itirib bütün cahanı!
Dədələr yurduna bağlanan Bəhmən,
Yaşaya bilmədi vətən dərdindən.
Vəzifə başına gələn gədələr,
Bəylik iddiası edirdi səylər.
Hərbi nazir olan Rəhim Qazıyev,
Şuşada nə qədər görün yıxdı ev.
Dövlət başçısıydı o vaxt Elçibəy,
Belə söyləmişdi adı gedən bəy.
– Qayadan enmişlər laçınlar düzə,
Təşəkkür etsinlər bir qədər bizə.
Niyə inciyirsiz, burda nə var ki,
Geriyə qayıtmaq, iki vur iki.
Çox sadəlövh idi o zalım oğlu,
“Səbri, təmkini” var idi çoxlu.
Bir vaxtlar o, azadlıq istəmişdi,
Onun üçün də xalq onu sevmişdi.
Ancaq gərəkdir ki, hər Vətən sevən,
Gərək yapışmasın yüksək kürsüdən.
Dövlətə başçılıq edən cəngavər,
Böyütsün ölkəmi Xətai qədər!

Ölkədə hərc-mərclik davam edirdi,
Kim nə istəyirdi onu edirdi.
Rüşvətin göstərdi o, belə yolun,
Dedi ki, alanda, bir az az alın.
Rüşvətlə yaltaqlar keçirlər başa,
Hardasan ay Köprülü Mehmet Paşa?!

**Haşiyə:** *Osmanlı imperatorluğu XVI əsrin ortalarında içindən çürüməkdəydi. Sosial ədalət artıq pozulmuşdu. Bütün Avropanı xərac verməyə məcbur etdiyi o parlaq dövrlər artıq geridə qalmışdı. Rüşvət, oğurluq, yaltaqlıq başdan-başa ölkəni çulğalamışdı. Məmurlar rüşvətə satılırdılar. Kim çox pul verirdisə vilayətlərə onlar atılırdılar. Rüşvətin belə ayaq açdığı bir zamanda pulla vəzifəyə keçənlər verdikləri pulun əvəzini min qat çıxarmaq üçün xalqı qəddarcasına soyurdular. Dövləti ən çox xocalar və saray qadınları idarə edirdilər. Qərbdəki texnika da durmadan inkişafdaydı. Xalqı sümürənlər və dini sözlərinin gəlirləri üçün dayaq edənlər hər bir yeniliyə “kavus icadı” deyib baltalayırdılar.*

*Taxta gətirilənlər tez-tez dəyişirdilər, hətta bir gündə taxta iki nəfər təyin edirdilər.*

*Bu zaman Osmanlı taxtında 14 yaşında Ovçu Mehmet oturmuşdu. Osmanlı taxtına 6 yaşından çıxarılan ovçu Mehmet həm yaşının kiçikliyi, həm də bütün vaxtını ovçuluqda keçirdiyi üçün dövləti saray qadınları idarə edirdilər.*

*Köprülü Mehmet Paşa Osmanlı imperatorluğuna ölkənin çox ağır vaxtlarında, 78 yaşında taxta çıxarılmışdı. O, ölkəni bürüyən xəstəliklərin kökünü bilirdi, bu xəstəliklərin müalicəsini də yaxşı anlayırdı. Gözü qaralmış idarəedicilərі ancaq cəza tədbirləri ilə susdururdu. Ölüm tədbirləri ilə vətən xaini varsa hamısını aradan götürmüşdü. Bu işində heç bir mərhəmət hissinə qapılmamışdı. Ancaq bu şiddətli, enerjili təmizləmə nəticəsində ölkəni gəmirən parazitləri əzmiş və yaxşılığa doğru tədbirlər görmüşdü.*

*Digər tərəfdən də hərbi sahədə də qələbələr qazandı, Benedikliləri Egey dənizindən qovdu, əldən çıxmağa bir barmaq qalmış Transilvaniyanı düşmən əlindən qurtardı...*

**Haşiyənin mənbəyi:**

*"100 böyük türk". Bakı, 1991*

**OVQAT**

## FƏDAKAR ANA

Dünya bir möcüzədir. Bu dünyanın möcüzələri isə bir-birindən həm görünüşünə, həm də sehrli olmağına görə insanları təəccübləndirir. Allahın yaratdığının ən mürəkkəbi, ən mükəmməli insandır.

Yaşamaq, yaratmaq hər bir insanın arzusudur. Axı hər arzu da gerşəkləşmir. Arzuları gerçəkləşdirmək anaların əlində olsaydı, bütün arzular yerinə yetərdi. Yəqin ki, onda tarazlıq pozulardı.

Ana! Ana kəlməsi elə məlahətli, elə ağızdolusu səslənir ki, bu sözün necə mənalı, sözlə dolu, ecazkar olduğunu başa düşürsən. Ana olmaq, o hissləri yaşamaq, duymaq, övladına əsl ana olmaq müqəddəslikdir.

Hər övladı olana ana demək olmaz. Bəzən "ana" olanlar övladlarına qayğı ilə yanaşmır, onların istəklərini yerinə yetirmirlər. Bu laqeydliklər elə həddə gətirib çıxarır ki, hətta onlar uşaqlarından belə imtina edirlər. İllərlə həsrətini çəkənlər, övlad sahibi olmayanlar imtina edilmiş uşaqları övladlığa götürüb tərbiyə edirlər. Belə məqamda onları tərbiyə edənləri ana, həmin uşaqları dünyaya gətirənləri isə heç insan da adlandırmaq olmaz.

Belə bir haşiyə çıxaq. Qoyun-quzu qurd ilə düşməndir. Qoyun-quzu aciz, canavar isə qəddar, vəhşi bir heyvandır. Buna baxmayaraq, qoyun görəndə ki, canavar onun balasını yemək istəyir, onda balasına qarşı olan

istəyindən canavarın üstünə hücum çəkir. Heyvan belə balasına qarşı istəyi başa düşür. Amma "analar" Allahın insanlara bəxş etdiyi gül parçası kimi övladlarından imtina edirlər. Şükürlər olsun ki, beləlləri çox deyil. Kaş bütün uşaqlar ata-ana qayğısıyla böyüyə.

Yaxşı ki, müqəddəs ada layiq əsl, fədakar, övladının hər əzab-əziyyətinə qatlaşan, yorulmayan, əzmkar analarımız var. Vətən üçün, torpaqlarımızın azadlığı uğrunda döyüşən oğullarımızı böyüdən analar var.

Ana ən son tikəsini də övladına verir. Həyatda təmənnasız sevgi, təmənnasız yaxşılıq yalnız valideynlərə məxsusdur. Valideynlər övladının uğuruna sevinir, atdığı hər bir addımına, gülüşünə, sevincinə şərik olur.

Sağlam doğulmuş övladı böyütmək asandır. Bəzən "analar" hətta sağlam övladından üz çevirir, onun gələcək taleyi haqqında düşünmürlər. Fədakar analar da çoxdur. Gecə-gündüzü bir olan, heç vaxt şikayətlənməyən, gözü övladının üzündə qalan, onun gülüşünə sevinən, hər bir istəyini canla-başla yerinə yetirən analar var.

Övladının xəstəliyi ilə mübarizə aparan, həkim olmasa da, onun sağalması üçün əlindən gələni edən fədakar bir ana var. İnternetdən öyrəndiyi, insanlardan eşitdiyi hər nə vardısa, onun üçün etməyə var gücü ilə çalışdı. Mübarizə apardı. 7 il 2 ay gecə, gündüz dayanmadan, yorulmadan çalışdı.



2009-cu il aprel ayının 16-sı. Hamı sevinir, bir-birini təbrik edirdi. Axı dünyaya yeni bir insan gəlmişdi. Sən demə özü boyda dərd, özü boyda sevinc gətirmişdi. Görünüşcə mələk üzlü, daxilindən isə xəbərsiz idi hamı. Həm mozaik daun, həm də ağciyərindəki qüsur – milyonda 4 nəfərdə olan bir xəstəlik.

Adını babası qoydu: Sadiq. Ata, ana, baba, nənə, bibiləri, demək olar ki, hamı bütün sevgisini ona bağlamışdılar.

Adı Sadiq olsa da, həyat sənə sadiq olmadı. Həkimlər dəfələrlə ata-anasının üzünə "havayı əziyyət çəkməyin" söyləmişdilər. Xarici ölkəyə qədər apardılar. Həkimlər əməliyyatın artıq gec olduğunu söylədilər. Ümidsiz qalan valideynlər onun hər gün yaşadığına sevinirdilər. Onun hər aldığı nəfəs onların nəfəsi idi. Onlar Sadiqin nəfəs alması üçün əsl mübarizə aparırdılar. Ailədə 4 uşaqdan biri idi Sadiq. Bütün qayğı, diqqət yalnız Sadiqə yönəlmişdi. Onun danışdığı sözlərə sevinir, atdığı addımlara şadlanırdılar. Özü həssas, mehriban, sağlam görünən insanlardan qat-qat düşüncəli idi.

Ən çox sevdiyi, yaxın dostu telefon idi. Görüntülü danışmağı lap çox istəyirdi. Səs-küyü sevməz, hündürdən güləndə isə pis olardı.

2016-cı il sentyabr ayının 15-də I sinfə gedəcəkdi. Qismət olmadı.

Sadiq az ömrü ilə çox sevildi. Elə çox ömür sürənlər var ki, bu qədər sevgi qazana bilmir.

Sadiq, hər an, hər saniyə, hər dəqiqə, hər saat bizimləsən.

7 il 2 ayda sən hər çətin nəfəs aldıqca ata-anan başın üstə göz yaşı töküb, hər səni danışdıranda ürəkləri yanıb.

2016-cı il iyun ayının 23-ü qəflətən xəstələndi. Həkimlər əlac eyləyə bilmədilər və söylədilər ki, artıq heç nəyin xeyri yoxdur, aparın. Anası qoymadı ki, kimsə ağlasın. "Sadiq səs-küyü sevmir", – dedi.

Xəstəxanadan evə qədər Sadiqi heç kimə vermədi. Qucağında saxladı. Onun qulağına ürəyindən keçən sözləri asta-asta pıçıldayaraq deyirdi. Axı Sadiq dəfələrlə belə ağır vəziyyətlərdən çıxmışdı. Sən demə bu dəfə Sadiqin vəziyyəti çox ağır imiş. 7 yaş 2 ay yaşadı. Gəlişi ilə hamını nə qədər sevindirmişdisə, ölümü ilə də bir o qədər yandırdı. Sadiq sonsuza qədər əzizlərinin qəlbində hər zaman yaşayacaq. Çünki o bir mələk idi.

*Dərd üstündən dərd gətirdin sən mənə,*
*Ata, anan, qohum, qardaş de necə*
*Tab gətirsin ayrılığa Sadiqim?!*
*Gülər üzlü, şirin sözlü Sadiqim!*

*Gül çöhrəndən təbəssümlər saçıldı,*
*Addımladın, sevincimiz çoxaldı.*
*Danışdığın kəlmələrin nağıldı,*
*Gülər üzlü, şirin sözlü Sadiqim!*

*Qoğal kimi yumru, bal kimi şirin,*
*Həyatım dəyişdi sənlə büsbütün.*
*Aldığım nəfəs də, görən gözüm də*
*Səndin, mələk üzlü şirin Sadiqim!*



**Sayad QARAYEVA,**
***Laçın rayon 7 №-li tam orta məktəbin ibtidai sinif müəllimi***

**MÜNASİBƏT**



**Vəzirxan SÜLEYMANOV**

## FƏRQ QOYANLAR DƏRDƏ DÜŞSÜN

Əziz və hörmətli oxucular, mənim sizə qısa olaraq bir neçə kəlmə sözüm var. Bu ürək sözlərimi sizə çatdırmaq üçün "Laçın yurdu" jurnalının redaksiyasına müraciət etməyi özümə borc bildim. Hamıya məlumdur ki, biz çoxmillətli bir dövlətik. Tolerantlıq bizim əqidəmizdədir və ata-babadan gələn bir saf duyğu, bir təmiz haqq – həqiqətdir. Azərbaycanda rus, ləzgi, avar, lahıc, yəhudi, tat, talış, kürd birgə yaşayırlar. Biz tarixən bütün xalqların dilinə, dininə, adət-ənənələrinə hörmətlə yanaşmışıq. İndi də eləyik və həmişə də elə olacaq. Mən daha yaxından tanıdığım, indiyə qədər doğma qardaş kimi yaşadığımız kürd xalqından az da olsa söhbət açıram. Mən bir vətənsevər şair olaraq ölkəmizdə bizimlə birgə yaşayan bütün millətləri sevmişəm və sevirəm. Təbii ki, bu sevginin nankor qonşularımıza aidiyyəti yoxdur.

Ürək sözlərimi sizə bir neçə bəndlik şeirimlə çatdıracağam. Lakin əvvəlcədən qeyd etməliyəm ki, Laçında Qarakeçdi, Ağbulaq, Şeylanlı, Ağcakənd və digər kürd kəndlərində mötəbər el ağsaqqalları, ziyalılar, vətənpərvər mərd igidlər, alimlər, şairlər yetişmişdir. Qarakeçdi kəndində el ağsaqqalı Həsən əminin böyük bir nəsli vardır. Bir sıra ziyalı, tanınmış mərd adamların adını çəkmək istəyirəm. Hamısı bizim üçün əzizdir. Ancaq adları çəkilməyən əziz dostlar, səxavətli igid kişilər bizdən inciməsinlər. Qarakeçdi Məhəmmədəli, Soltan, İsgəndər, Azad, Hüseyn müəllim, Ağa müəllim – tələbə yoldaşımdır, Əliheydər, Əhliman, Mirağa, Bəbir müəllim, Əyyub, mənim əziz dostum Azay, ata-baba dostumuz Sadıx kişi, oğlanları Saday və Aşıq Umbay... Biz onlarla həmişə bir doğma qardaş kimi yaşamışıq, qohumlaşmışıq, qız verib, qız almışıq. Necə deyərlər, qaynayıb-qarışmışıq. Ola bilər ki, bəzi kəmsavad, insanlığı dərk etməyən cılız xarakterli insanlar müəyyən təsirlər altına düşüb başqa cür yozar, öz əqidəsinə uyğun qiymət verər. Amma bizim Vətənimiz birdir, dövlətimiz birdir, yerimiz-yurdumuz birdir, şərəfimiz, şöhrətimiz birdir, canımız, qanımız, qeyrətimiz birdir. Bizi bir-birimizdən heç kəs ayıra bilməyib və ayıra bilməz. Bu mümkün deyil.

Mənim burada, yəni Sarıqayada (Sumqayıt) bir neçə kürd qonşum, dostlarım var. Mən onlarla fəxr edirəm. Şafa Ağcakəndən, İsa Minkənddən,

Asif isə Laçındandır. Mərhum şair Kürd İmranın övladları Ayaz, Niyaz, Saməddin də Ağcakənddə adlı-sanlı nəslin nümayəndələridir. Məşhur xanəndə Abdulhüseynin nəvələri və el ağsaqqalı Bahadur kişinin bacısı uşaqlarıdır.

İndi bu şeirimi təqdim edirəm. Kim necə başa düşüb dərk edər, özü bilər. Bu, mənim ürək sözlərim və tam həqiqətdir.

**ÜRƏK SİRDAŞIM**

Bu şeiri yazıram qalsın yadigar,
Qoy gəzsin dünyanı diyarbadiyar.
Kim bizə sədd qoyar, kim çəkər hasar,
Təzə nə söyləyim, nədən danışım? –
Mənim kürd qardaşım, ürək sirdaşım.

Bir gün Əyriqara taxarıq bayraq,
Ata-baba yurdumuzdur o torpaq.
Bir-birə olmuşuq biz arxa-dayaq,
Ey əqidə dostum, məslək yoldaşım,
Mənim kürd qardaşım, ürək sirdaşım.

Qanımız bir, dinimiz bir olubdur,
Xeyrimiz bir, şərimiz bir olubdur.
Obamız bir, elimiz bir olubdur,
Unutmaram, bil möhkəmdir yaddaşım,
Mənim kürd qardaşım, ürək sirdaşım.

Bütöv Qarabağdır Arazdan Kürə,
Xain, xoflu bunu yozar bir cürə.
Qaynamışıq, qarışmışıq bir-birə,
Tarix boyu unudulmaz yurddaşım,
Mənim kürd qardaşım, ürək sirdaşım.

Vəzirxanam, Sədalıdır bir adım,
Kəndim Kaha, Mirzələrdir soyadım.
Mən seyidəm, İmam Əli ustadım,
Nifaq salanları tutar qarğışım,
Mənim kürd qardaşım, ürək sirdaşım.

**HAQQIN SƏSİ**

Bəşərin dünyada birdi soykökü,
Fərqi nədir, dildən başqa fərqi nə?
Baba Adəmdirsə, Həvva nənəmiz,
Fərq qoyanlar desin görək dərdi nə,
Millətlərin bir-birindən fərqi nə?

Hakim, məhkum, ağa da var, nökər də,
Öz dövründə hər kəs olub sərkərdə.
Ya Xətai, ya Suvarov, ya Babək,
Bilən yoxdur fərq qoyanın dərdi nə,
Millətlərin bir-birindən fərqi nə?

Ya kapital, ya sosial, ya da çar,
Dövlətin xüsusi qanunları var.
İsavi, Musavi, qara, ağ, sarı,
Fərq qoyanın hamı bilir dərdi nə,
Millətlərin bir-birindən fərqi nə?

Kasıb hökmdardan ədalət umar,
Ölkələr var, həqiqətə göz yumar.
Bir-birinin torpağına, yurduna
Göz dikənin doymur gözü, dərdi nə,
Millətlərin bir-birindən fərqi nə?

“O kamil başçılar gəlsin özünə”,
Bərpa etsin ədaləti düzünə.
Kim yanacaq bu dünyanın dərdinə,
Fərq qoyanlar özü düşsün dərdinə,
Millətlərin bir-birindən fərqi nə?

Nifaq salıb qan tökməkdən nə çıxar,
Çıx meydana, haqq söz danış aşikar.
Yalandan sülh demə, vicdanın olsun,
Fərq səndədi, dərman səndə dərdinə,
Millətlərin bir-birindən fərqi nə?

Öldürmərəm bir qarışqa, bir arı,
Onların da zövqü, gözü, canı var.
Ayırma bir-birdən heç bir diyarı,
Hər millətin qeyrəti var, qanı var,
Alman, yapon, ya türk, ya fars, ya ərəb,
İnsan yanar hamısının dərdinə,
Millətlərin bir-birindən fərqi nə?

Bir dığa tutmuşduq biz də o vaxtı,
Anam dönüb baxdı, yaman ağladı.
Dedi: "And verirəm, oğul, südümə,
Körpədir, günahdır onu öldürmə.
Onun anası var, o da anadır,
Sən mənə çox əziz olduğun kimi,
O da anasına əziz baladır".
Oğul, gözlə haqq bir zaman gələcək,
"Yaxşılıq et, at dəryaya balığı,
Balıq bilməsə də, xalıq biləcək".
Bu hikməti qanmayanın dərdi nə,
Bu millətin fərqi nədir, fərqi nə?

Haqdan, ədalətdən kim ki qıraqdır,
Fərq qoyanlar insanlıqdan uzaqdır.
Lap doğrusu vicdansızdır, alçaqdır,
Fərq qoyanlar desin görək dərdi nə,
Millətlərin bir-birindən fərqi nə?

Şair, bu şeirinlə dünyanı oyat,
Ərşə dirənibdir ah ilə fəryad.
Ya xaç çək, fərqi yox, ya da salavat,
Qəlbi pak olanlar varmaz fərqinə,
Bax bunlardır dərman mənim dərdimə,
Millətlərin bir-birindən fərqi nə?

Yığışa bir yerə bəylər, paşalar,
İnsaf edib cin düyünün açalar.
Bu zülmət dünyaya bir nur saçalar,
Dərd qarışıb Vəzirxanın dərdinə,
Millətlərin bir-birindən fərqi nə?
Fərq qoyanlar özü düşsün dərdinə.

**UNUTMA!**

Laçın rayonu 18 may 1992-ci ildə erməni təcavüzkarları tərəfindən işğal edilib. İşğal nəticəsində Laçın şəhərində, Qayğı qəsəbəsində və 125 kənddə olan 13845 fərdi yaşayış evi, 48 sənaye, 63 kənd təsərrüfatı obyekti, 217 mədəni-maarif, 101 məktəb, 5 məktəbdənkənar, 3 məktəbəqədər müəssisə, 142 səhiyyə, 460 ticarət obyekti itirilmişdir.

Qarabağ müharibəsində 333 nəfər şəhid, 225 nəfər əlil olmuş, 33 nəfər hər iki valideynini itirmiş, 5 nəfər Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür. Laçın rayonu işğal edildikdən sonra rayonun 58299 nəfər əhalisi respublikanın 59 rayon və şəhərində müvəqqəti məskunlaşmışdır.




Kompüter və dizayn: **Araz YAQUBOĞLU**
Korrektor: **Firuzə NƏSİBLİ**
Operator: **Cəlal ARİFOĞLU**

Yığılmağa verilmişdir: **11.05.2016**
Çapa imzalanmışdır: **15.09.2016**
Şərti çap vərəqi: **6.** Sifariş **№22**
Kağız formatı: **70x100, 1/16**
Sayı: **300.** Qiyməti: **3 AZN**

*Jurnal **“Elm və təhsil”** nəşriyyat-poliqrafiya müəssisəsində hazır diapozitivlərdən çap olunmuşdur.*
***E-mail:** nurlan1959@gmail.com*
***Tel:** (+99412) 497-16-32, (+99450) 311-41-89*
***Ünvan:** Bakı, İçərişəhər, 3-cü Maqomayev döngəsi 8/4.*